DOI: 10.36719/AEM/2007-2020/52/16-20

**Göyərçin Şahlar qızı Kərimi**
Bakı, Azərbaycan
gkyarchinsh@gmail.com

# BƏDİİ ƏDƏBİYYATDA QADIN VƏ KİŞİ OBRAZININ PSİXOLOJİ ƏSASLARI

***Açar sözlər:*** *idrak, qadın obrazı, kişi obrazı, bədii təxəyyül, real hadisələr, psixologiya, bədii təzahür formaları*

***Key words:*** *cognition, female image, male image, artistic imagination, real events, psychology, forms of artistic expression*

***Ключевые слова:*** *познание, женский образ, мужской образ, реальные события, психология, формы художественного выражения*

## Giriş

Kişi və qadının fərqli cəhətləri haqqında, əlbəttə, çox deyilir, çox yazılır, lakin yekun nəticə əldə etmək mümkün olmur, çünki yer üzündə nə qədər insan varsa, o qədər də psixika var. Digər tərəfdən, psixologiya bir yerdə dayanıb gözləmir ki, ona çatıb nəfəsini dərəsən. Gündə neçə uşaq doğulursa, onların sayı qədər də psixoloji vəziyyət meydana çıxır. Elə buna görə də mütəxəssislər durmadan psixologiya ilə məşğul olurlar ki, gündəlik problemləri yüngülləşdirmək asanlaşsın. Psixoloji vəziyyətin mənbəyi beyində yerləşdiyinə görə, ensefalonun mütəmadi araşdırılması tədqiqatçıların ən mühüm vəzifələrindəndir.

Bu mövzuya müraciət etməkdə niyyətimiz qarşı cinsin psixologiyasını mükəmməl bilmədikləri üzündən yazarların gerçək həyatda şahidi olduqları, yaxud olmadıqları hadisələrin bədii təsviri zamanı yaşadıqları çətinliklərin uyğun izahına təşəbbüs göstərməkdir. Öyrənmək istəyirik ki, qadın və kişi psixologiyası qarşılıqlı olaraq nə qədər başa düşüləndir və bu başa düşülənliyin təcrübəyə istinad edən hissəsi böyükdür, yoxsa ehtimala əsaslanan?

Məqalə ədəbi əsərlərdə hadisələrin psixoloji cəhətdən düzgün ifadəsi üçün müəllifin fantaziyaya nə dərəcədə güvənməli olması məsələsini nəzərdə saxlayır. Məqsədimiz əks cinslərin oxşar və fərqli anatomiyasının onların psixoloji düşüncə tərzinə uyğun gəlib-gəlmədiyinin fəlsəfi təhlilinə çalışmaq, yalnız fizionomiya cəhətdən kişidən fərqlənən qadının bütün məsələlərdə ondan geri qaldığını iddia edən əsassız fikirlərə münasibət bildirməkdir. Xanımlar haqqında, hətta mütəfəkkirlər tərəfindən söylənilən mənfi fikirlərin doğruluq sərhəddini araşdırmaq, qadının feminizmlə heç bir əlaqəsi olmayan azad düşüncəsindən bəhs etmək istəyirik.

**Kişi və qadının anatomik fərqi.**

Anatomiyadan bizə bəlli olan biliklərə istinadən onu söyləyə bilərik ki, kişi və qadının bədən quruluşu biri digərindən yetərincə fərqlənir; birincinin bütün daxili və xarici orqanları ikinciyə nisbətən həcm etibarı ilə böyükdür, lakin bu böyüklüyün şüurla, düşüncə tərzilə düz mütənasib olduğunu dilə gətirmək, əlbəttə, doğru olmaz. Əgər varlığın yaradıcılıq qabiliyyəti, sadəcə, beyninin həcmindən asılı olsaydı, onda o, heç vəchlə öküzdən irəli keçmək imkanı qazana bilməzdi. Deməli kişilərin daha ağıllı olma səbəbi kimi beynin həcmini nəzərə almaq əsaslı mülahizə deyil.

Kişilərin qadınlardan əsas üstünlüyü ölçü vahidi vatt olan gücdür: N=1coul/t. Bioloji mənada cinsiyyət ayrılığını nəzərə almasaq, qalan bütün məsələlərdə onlar arasındakı fərqlilik nisbət əmsalları ilə ölçülür. Əgər kişinin ağciyəri qadının ağ ciyərilə müqayisədə 50% həcm böyüklüyünə malikdırsə, bu heç də o demək deyildir ki, kişi qadından əlli il uzun ömür sürməlidir. Deməli daxili və xarici orqanların hər hansı quruluş müxtəlifliyi xüsusiyyət fərqliliyilə müşaiyət olunsa da, mahiyyət ayrılığına səbəb yaratmamalıdır.

Kişi və qadının əlli təməl fərqindən söz açan mütəxəssislər özləri də yaxşı bilirlər ki, [1] söylədikləri mütləq mənada deyil, çünki ayrı-ayrı şəxslərin timsalında deyilənlərin tam əksini müşahidə edirik. Daha əvvəl qeyd etdiyimiz kimi bu məsələdə də dəyişən nisbətdir. Əgər qadının bədənində 3,6 litr, kişidə 4,5 litr qan varsa, bu, insan olaraq qadını kişidən ayırmaq üçün əsas sayıla bilməz. Ümumiyyətlə, istənilən xarakterik cəhəti araşdıranda onun bütünlüklə kişiyə, ya qadına məxsus olması haqqında yekdil nəticə əldə etmək müşkül məsələdir.

Yuxarıda sadalananlara onu da əlavə etmək yerinə düşər ki, uzun-uzadı heyvan beyni ilə insan beyninin oxşar və qeyri-oxşar quruluşundan söhbət açan mütəxəssislər birincidə düşünmə qabiliyyətinin olmaması səbəbini, yaxud insan beyni ilə heyvan beyni arasındakı fərqi hələ də öyrənə bilməyiblər. İnsanı heyvandan fərqləndirən əsas cəhətlərdən biri yaddaş həcmi, digəri nitqin olmasıdır. Lakin onu da nəzərə almaq lazımdır ki, doğulan gündən heyvanlar arasına atılmış uşağın danışabilmə ehtimalı hələlik bizim üçün sual altındadır.

Beləliklə, beynin fərqli anatomik quruluşu fərqli psixologiyanın yaranmasına vasitə olsa da, düşüncə tərzinə təsir göstərmir. Düşüncə qadın təbiətlidir, qavradığını doğur. Düşüncə azaddır, onun yolunu ancaq düşünən insanın müvafiq xəstəliyi, yaxud ölümü bağlaya bilər. Görünür, [2] böyük azərbaycan şairi M. Ə. Sabir elə bu mənada yazırdı: "...Qabili-imkanmı olur qanmamaq?"

Kişinin qadından üstünlük dərəcəsi kimi neyron sayını əsas götürmək cəhdimiz də yanlışdır, çünki düzənlik filində insana nisbətən 168 milyard artıq neyron [3] var.

Deməli heç bir xüsusiyyətini nəzərə alıb qadınla kişini qəti şəkildə bir-birindən fərqləndirmək mümkün deyil, qadın yeganə cəhəti – dünyaya uşaq gətirmək qabiliyyətilə kişidən seçilir və o da məlumdur ki, dünyanı – hər kəsi, hər nəyi dərk edən idrak özünü dərk etməkdə acizdir:

"Təxəyyül, xəyala, zövqə görədir,
İdrak özünə də sirrdir həmişə..."[4, s.23]

Əgər idrak özünü dərk edə bilmirsə, onda şüurun hansı cinsdə necə olması barədə birmənalı şəkildə fikir yürütmək cəhdimiz qəbul edilən sayılmamalıdır. Çünki hamı dünyaya inkişaf etməmiş beyinlə təşrif gətirir və sonrakı mərhələ toxumun hansı torpaqda daha çox məhsul verəcəyinə uyğun olaraq beyindaxili və beyinxarici proseslərdən asılıdır. Araşdırmaların nəticəsi kimi onu söyləmək olar ki, kamil beyin kişi və qadın beyinlərinin quruluş və xüsusiyyətlərini özündə birləşdirir. Əgər kişi və qadın beyninin üst-üstə düşən quruluşunu «A», üst-üstə düşməyən formasını «B» və «C» ilə işarə etsək, onda ümumi düstur belə olmalıdır: Kamil beyin = [A+B+C], eynən yunan mifalogiyasında deyildiyi kimi: "İnsanlar nə vaxtsa ikicinsli [5] olmuşlar və bu səbəbdən qadınla kişi həmişə öz yarısını axtarır". Bu düstur riyaziyyatda toplamanın kommutativliyidir, yəni toplananların yerini dəyişməklə cəm dəyişmir.

Limbik sistemin görünüşcə kimdə necə olmasından asılı olmayaraq o, hamıda eyni funksiyanı yerinə yetirir, fərq, artıq qeyd etdiyimiz kimi, qadının zəif, kişinin güclü təbiətindən irəli gələn xarakterik cəhətlərə görədir.

Kobud bir müqayisə aparaq. Eyni növdən olan kartof eyni sahədə, lap bir-birinin yanında, amma müxtəlif formalarda – böyük, kiçik, uzunsov, oval və s. yetişir, keyfiyyət isə sabit olaraq qalır. Qida məhsulu kimi bizim üçün mühüm olan, əlbəttə, görünüş yox, keyfiyyətdir. Deməli, düşüncə məsələsində də belədir: əsas olan quruluş yox, imkan dərəcəsidir. Təcrübə yolu ilə bizə o da məlumdur ki, kişi elmin, yaxud həyatın müəyyən sahələrində müvəffəqqiyyət əldə edirsə, qadın kişinin müvəffəq ola bilmədiyi sahələrdə üstünlüyə imza atır.

Artur Şopenhauerin "Dünya iradə və təsəvvür kimi" əsərinə istinadən söyləmək olar ki, "idrak ilkin olaraq öz mahiyyətinə görə bütünlüklə iradənin xidmətindədir..." [6, s.342] Bu o deməkdir ki, şüur istənilən varlığa ehtiyaclarını ödəməyə vasitə olsun deyə verilib. Öz mahiyyətini dəyişdirməyən idrak iradənin, başqa sözlə, arzuların xidmətində dayanır və ilkin idrak səviyyəsində kişilərin daha ağıllı olması onların beyin quruluşundan irəli gələn xarakterik cəhətləri, daşıdıqları statusları ilə əlaqəlidir, lakin iradəyə xidmət etməyən idrak hər iki tərəfdə eyni olduğuna görə, cinslər arasında psixoloji anlaşılmazlıq yaranmır, bir sözlə, dərkolunmazlıq idrakın iradəyə xidmət səviyyəsində, yəni Platonun "həmişə yarananlar və məhv olanlar" dünyasında baş verir.

Əgər insanın bütün üstün cəhətləri, dünyanı dərk etməsi, ondan kənara çıxması, hansısa böyük elmi kəşfə imza atması düşüncənin məhsuludursa, onda «iradəni ideyadan, ideyanı təzahürdən fərqləndirməyi» bacaran subyektlər sırasında qadın, kişi məfhumu yoxdur. [6, s. 351]

**Kişi və qadının psixoloji fərqi.**

Qadın və kişi psixologiyası bir-birindən yetərincə fərqlənir, hətta o qədər fərqlənir ki, tərəflər müəyyən şəraitlərdə kimin hansı addımı atacağını təxmin etməkdə çətinlik çəkirlər. Müəyyən hadisələrə mütabiq olaraq kişilərin qadınlar, qadınların kişilər haqqında söylədikləri fikirlərin əsas hissəsi həmişə ehtimaldan ibarət olur, baxmayaraq ki, bu ehtimalların həqiqət olma ehtimalı da az olmur.

Psixologiya elmi nə qədər qadın və kişi psixologiyasının üst-üstə düşən, düşməyən cəhətlərindən bəhs etsə də, həmişə gizlində, yəni söhbət açmayacağı, yaxud aça bilməyəcəyi nəsə qalır. İnsanın müvafiq hadisəyə adekvat reaksiyasının necəliyi öz həmcinsi tərəfindən daha düzgün müəyyən edilir. Məsələn, kişi cavabın eyni olacağını dərk etmədən intim münasibətdə olmaq istədiyi əks cinsin nümayəndəsinə illərlə eyni üsulla əziyyət verə bilər, lakin cavabın kafi olmasından ötrü özünü, yaxud mühiti dəyişdirməyin zəruriliyini, təzyiq etməkdən çəkinməyin vacibliyini nəzərə almaz və ona elə gələr ki, qadına zor tətbiq etməklə istəyinə qovuşacaq.

Əlbəttə, zor tətbiq etməklə nəinki istənilən varlığa, hətta şəhərə, ölkəyə də sahib çıxmaq mümkündür, lakin bu o demək deyildir ki, təcavüzə uğrayan tərəf həmişə taleyilə barışacaq, hətta barışıq olsa belə, ruhən rahatlıq tapmayana qədər o, əks mövqe nümayiş etdirərək ölçüyəgəlməyən ağrılar yaşayacaq.

Qarşıya qoyulmuş hansısa tapşırığın həlli üçün kişi və qadın beyinlərinin müxtəlif hissələrindən istifadə etsələr belə, müvəffəq olmaq mənada nəticə dəyişməz olaraq qalır. Aşağıdakı linkə istinad etsək, qadınla ki-

şinin fərqli xüsusiyyətindən bəhs edən növbəti fikir belədir: əgər yolun üzərində top varsa, kişi ona təpiklə zərbə endirəcək, qadın isə ən yaxşı halda topu əlinə götürəcək və ya sinəsinə sıxacaq. [7] Şəxsən mən özüm ağlım söz kəsəndən indiki yaşıma qədər yolumun üstündə nə vaxt top görürəmsə, özümü qapıya zərbə endirən futbolçu kimi aparmaqdan saxlaya bilmirəm və onu əlimə götürmək ağlımdan keçmir.

Fransız yazıçısı Jean Grangenin [8] qadın haqqında söylədiyi fikrə nəzər salaq: "Qadın heç getməyəcəkmiş kimi sevər, amma yeri gələr, heç sevməmiş kimi gedər". Yazıçı əks cinsin nümayəndəsi haqqında belə düşünür, lakin bu xüsusiyyət qadınlara aid olduğu qədər kişilərə də aiddir, ümumiyyətlə, insana aiddir və o, hamıda eyni şəkildə təzahür edir. Digər tərəfdən, istənilən hadisənin iki tərəfliliyinə əsaslanaraq söyləyə bilərik ki, irəli getməyə sərf olunan enerji geri qayıtmaq üçün lazım olan enerjiyə bərabərdir. Bu mənada bütün proseslər istiqamətini dəyişməyə, yaxud öz əvvəlinə qayıtmağa tədricən müvəffəq ola bilirsə, sevgini tədricən, düşünülmüş şəkildə nifrətə çevirmək imkan daxilində deyil, hər nə olacaqsa, əsasən, bir anda baş verir. Necə ki, hündürlükdən itələnən kütlə yerə tədricən yox, bir anda düşür, buna oxşar olaraq sevgi də bir göz qırpımında heç yox imiş kimi özünün əksinə yönəlir. Deməli **məhəbbətin cinsi** yoxdur.

"Bir zamanlar kişinin üstün olduğuna inanırdım, sonra evləndim, həyat yoldaşım bu inancımı məhv elədi", – deyə səslənən amerikalı aktyor Cak Lemmonun qadınlara qarşı pozitiv münasibəti həyati gerçəkliyin nümunəsi olaraq könlümüzü oxşayır. [9]

Bəzi filosofların qadınlar haqqında empatiyasız fikirlərinə gəlincə isə onları qınamaq da olar, qınamamaq da. Ona görə qınamaq olmaz ki, dahilər uzağa baxırlar və insanlarda dəyər verdikləri yeganə cəhət zəkaüstü düşüncə tərzidir, lakin bütün qadınlara eyni münasibəti bəsləməklə onlar da qınaq obyektinə çevrilirlər. Məgər bütün kişilər oxşardır? Nəzərdən qaçırmayaq ki, Platon dövlət qoruyucularının güclü və zəif kişilərdənsə, güclü kişi və güclü qadından ibarət olmasının tərəfdarı idi. [10]

Mübahisəyə cəlb olunası daha bir nüans klassik alman fəlsəfəsinin nümayəndəsi Georq Vilhelm Fridrix Hegelin qadınlar haqqında söylədikləridir: "Qadınla kişi arasındakı fərq heyvanla bitkinin arasındakı fərq kimidir; heyvan kişinin, bitki isə qadının xarakterinə uyğundur. Əgər qadın dövlətin başındadırsa, həmin dövlət təhlükə altındadır. Çünki onlar bütövün tələblərinə deyil, təsadüfi meyillərə, yaxud rəylərə uyğun hərəkət edirlər. Bilgi qadınlara naməlum yollardan – təhsildən daha çox həyatdan gəlir. Kişilər isə öz mövqelərini, sadəcə, qazanılmış düşüncə və texniki əziyyətlə əldə edirlər". [11]

Ola bilsin ki, hörmətli Hegel öz fikirlərində qadının zərif təbiətindən irəli gələn "qüsurlar"ı nəzərdə tutur, lakin bu o demək deyil ki, qadın dövlət idarə edə bilməz və yaxud onlar öz bilgilərini təhsildən yox, naməlum yollardan əldə edirlər.

Bu yaxınlarda yazıçı Seyran Səxavətin bir yazısını oxudum. O, qeyd edirdi ki, cümlə qurmaq dövlət qurmaq qədər çətindir. Əgər qadın cümlə qurmağı bacarırsa, niyə dövləti idarə edə bilməsin? Hətta subyektiv fikrimizə görə, cümlə qurmaq işi daha çətindir. [12]

Hegelin fikirlərilə başlanan öz - mübahisəyə son qoymazdan əvvəl onun arvadı haqqında yazılan bir neçə cümləyə nəzər salaq: "Özünün məşhur səyahətindən Berlinə zəfərlə qayıdan, hansı ki, uğurlu çıxışları ilə qadınlar arasında çoxlu səs-küyə səbəb olmuşdu, Aleksandr fon Humbolt universtetdə silsiləvi mühazirələr deyirdi. Hətta yeri (*alman konformistlərinin tanış üçlüyü: "K" – Kirche, Kinder, Kuche*) kilsə, uşaqlarının yanı və mətbəx sayılan Hegelin arvadı ərinin ciddi narazılığına baxmayaraq həmin mühazirələrdə iştirak edirdi". [13] Göründüyü kimi, həmişə əri ilə qürur duyan Hegelin xanımı mənəvi ehtiyacını ödəmək məqsədilə Humboltu dinləyirmiş.

Ətrafında, cəmiyyətdə minlərlə alkoqolizm istifadəçisi olduqları üçün şüuru korşalmış əyyaş, avara kişiləri görməzdən gələn Hegel, görünür, bir nəfər də olsa, obyektiv düşüncəli qadına rast gəlməyib.

Fikrimizə görə qadın həm öz dövrünün, həm də dünyaya uşaq gətirdiyi üçün gələcəyin daşıyıcısıdır. Baxaq, poetik təsvir nə deyir:

"Qadın fərəh deyil, ləzzət umula,
Qadın kədər deyil, hər kəs unuda.
Qadın çiçək deyil, açıb-yumula,
Dahi olmasa da, müdrikdir o da". [4, s. 28]

Sonuncu misranın fikrimizlə uyğynluq təşkil etmədiyini nəzərə alaraq dahiliyin sirri barədə bir neçə kəlmə söyləməyi vacib hesab edirik: "Dahi kimdir?" – Uzun-uzadı izahata ehiyac yoxdur, mövqeyimizi nəzəri cəhətdən əsaslandırmaqdan ötrü bu günə qədər deyilən fikirlərə bir cümlə əlavə etməyimiz kifayət edir: "Dahi o kəsdir ki, dühanın sərhədlərini tanıyır, yəni avtoritetə istinad etmədən yaradıcılığı ilə tanış olduğu müəllifin dahi olub-olmaması barədə təkbaşına qərar verir".

Sonuncu misraya gəlincə, onu söyləyə bilərik ki, antik dövrdən başlamış bu günə kimi uzanan yüzilliklərin yetişdirdiyi müdrik qadınlar haqqındakı bilgilər dahiliklə zərif cinsin nümayəndəsi arasında mütənasib əlaqənin mövcudluğunu inkar etmir. Deməli qadınlar da dahi ola, öz fərdiliklərini yox edə bilərlər ki, bu

günə qədər etmişlər və mümkün olduqca edəcəklər.

İspan yazıçısı Migel de Servantes qadını zərif şüşəyə bənzədir və tövsiyə edir ki, [8] onun möhkəmliyini sınamağa çalışmasınlar, çünki hər an qırılar. Məlumdur ki, ancaq sevməyi bacaran insan başqaları haqqında belə qayğı ilə danışar. Sevgi çatışmazlığı bioloji patalogiyaya bənzəyir; müalicə olunmadıqca böyük fəsadlara yol açır.

**Psixoloji anlaşılmazlığın bədii ədəbiyyata təsiri.**

Beləliklə, qismən də olsa, əks cinslərin oxşar və fərqli anatomiyasının psixologiyaya təsirinin düşüncə tərzilə mütənasib olub-olmadığını fəlsəfi təhlil etməyə çalışdıq. İndi isə yazarların qarşı cinsin psixologiyasına mükəmməl bələd olmamaları səbəbindən gerçək həyatda şahidi olduqları, yaxud olmadıqları hadisələrin bədii təsviri zamanı yaşadıqları çətinliklərin uyğun təzahürünü işıqlandırmağa səy göstərək.

Mövzunun təhlil obyekti dahi rus yazıçısı L. Tolstoyun dünya şöhrətli “Anna Karenina” romanıdır. Ilk sualımız belədir: “Anna Kareninanın intiharetmə səbəbi nə idi? O nəyin və hansı əks qüvvənin təsirilə özünü qatarın altına atdı?”

Yazıçının qələmə aldığı kimi, Vronskinin soyuq münasibəti? Məgər Anna Vronskinin sevgisindən əmin deyildi, yaxud o bilmirdi ki, artıq bu sevgi ana ilə qızı arasında paylaşılıb?

Anna Karenina düşündüklərini bu sözlərlə ifadə edir: “O, məni sevir, ancaq necə? The zest is gone – Zövqü korşalmışdır. – Bəli, artıq o məndən əvvəllər aldığı zövqü almır. Əgər mən ondan ayrılsam, ürəyinin dərinliklərində sevinəcəkdir”. [14] Fikrimizə görə, Annanı intihar etməyə sövq edən səbəb söylədiyi bu cümlələrin əhatə dairəsinə aid olan həyati proseslər yox, daha ciddi olmalıdır. Ərz etsək ki, o, böyük məhəbbətin yüksəkliklərindən ailə, məişət qayğılarına düzgün eniş etməyib, yalan olar. Anna bu işi Vronski ilə birlikdə yaşamağa qərar verdiyi gün ustalıqla bacarmışdı.

Karenina özünü Vronskinin soyuq davranışına görə, əlbəttə, öldürməli deyildi, çünki soyuqluğun sosial durumla, ictimaiyyətlə səciyyələnən o qədər üzürlü tərəfləri var ki... İntiharın isə bir yolu, daha doğrusu, son kimi labüd yolu var. Mövcud şəraitdə bütün əməllərilə mühafizəkarlığa, kübar cəmiyyətin qaydalarına qarşı çıxan Anna Kareninanı yolun sonuna gətirən səbəb Vronskinin xəyanət etdiyini, ondan ayrılacağını dərk etmək təhlükəsi və buna bənzər özgə amil olmalı idi. Görünür, Tolstoy ərini, oğlunu tərk etdiyi üçün Annanı günahlandırmadığı kimi Vronskinin xəyanətini də təbii sanmışdır. Lakin əsərdə intiharın səbəbdən asılı olmayan nəticə kimi qələmə alınması, yəqin ki, yazıçının mürəkkəb qadın psixologiyasını bilməməsi üzündən yox, əksinə, daha yaxşı bələd olması səbəbindəndir ki, Tolstoy Annanı öldürməklə qadın haqlarının pozulmasına qarşı öz üsyançı mövqeyini nümayiş etdirmişdir.

Bədii ədəbiyyatda hadisələr, ya həyatdan götürülür, ya da məqsədə, ideyanın ötürülməsinə müvafiq olaraq uydurulur və bəzən bu kimi uydurmalar iki cinsin bir-birinin psixologiyasını yaxşı bilməməsi səbəbindən əsərdə müxtəlif səhnələrin süniləşməsinə yol açır. Elə buna görə də Lev Tolstoy: “Mənim qəhrəmanlarım öz istəyimlə deyil, real həyatın qaydaları ilə yaşamalıdırlar” – deyə səslənəndə özünün təkrarsız yazıçı təcrübəsinə istinad edirdi. [15] O, demək istəyirdi ki, psixoloji anlaşılmazlıq baş verməsin deyə hadisələr gerçək həyatdan götürülməlidir. Doğrudur, gerçək həyatdan götürülməlidir, lakin nəzərə almaq lazımdır ki, **eyni hadisənin müxtəlif şəraitlərdə bədii təsviri** həmişə eyni əks-sədanı doğurmur və uyğun ziddiyyət səbəb ilə nəticə arasındakı əlaqəni zəiflədir.

Yekun olaraq heç kimə sirr olmayan bir məsələdən bəhs etmək istəyirik. Aralarında baş tutan intim əlaqədən sonra kişilərdə müaşiqə həvəsi get-gedə zəifləyir, qadınlarda isə, əksinə, çoxalır. Eyni xüsusiyyəti uyğun qayda ilə bütün kişi və qadınlara şamil etmək mütləq mənada mümkün olmasa da, bu, əksəriyyət üçün belədir. İntim əlaqədən sonra kişilərdə baş verən davranış zəıifliyi onların əsas tərəf kimi çıxış etmələrilə bağlıdır; digər tərəfdən toxumun torpaqsız qalma ehtimalı torpağın toxumsuz qalma ehtimalından dəfələrlə kiçikdir.

Hadisələrin təcrübə vasitəsilə tədqiqi onu göstərir ki, homo sapiensin nail olmaq istədiyi nə varsa, əldə ediləndən sonra onun üçün əvvəlki dəyərində qalmır və bu mənada insanın əsl mahiyyətini məqsəd ilə məqsədəçatma nöqtələri arasındakı məsafə təşkil edir. Paradoksallıq ondan ibarətdir ki, bu xüsisiyyət hər iki cinsin nümayəndələri üçün eynidir, intim münasibətdən savayı...

Ayrılıq, özünə əl qaldırma kimi təsadüfi hadisələrə gəlincə, onlar da, əsasən, psixoloji anlaşılmazlıq səbəbindən üz verir.

Məqalənin ümumi mənzərəsini bir neçə kəlmə ilə belə ifadə etmək olar: “Qadınlara irad tutula biləcək xüsusiyyətin sayı qədər də kişilərin ittiham olunma cəhəti var; düzgün qərar diqqəti hadisənin təzahürünə yox, səbəbinə doğru yönəltmək bacarığından asılıdır”. Necə ki, insan bilicisi, şair-yazıçı-filosof Şəms Təbrizi deyir: “Qadın bilməyənə nəfs, bilənə nəfəs kimidir”. [8]

## Ədəbiyyat

1. https://modern.az/az/news/10211#
2. M. Ə. Sabir, “Hophopnamə”, Bakı, 1954, s. 108
3. https://ru.m.wikipedia.org/wiki/Список_животных_по_количеству_нейронов

4. G. Kərimi, "Dünya iradə və təsəvvür kimi", Bakı, 2018, s. 23
5. https://qafqazinfo.az/news/detail/usagim-ne-qizdir-ne-de-oglan-ermafroditzm-26558
6. «Мир как воля и представление»; А. Шопенгауэр: АСТ; Москва; 2020, ст. 342
7. https://barker.az/kisi-və-qadin-beyni-arasindaki-əsas-fərqlər/
8. https://azadqadin.az/munasibetler/mudrikkelamlar/43109-qadinlar-dahilerin-gzu-ile.html
9. fitret.az/qadin-haqqinda-aforizmlər/
10. http://qadinkimi.com/az/platon-feministdir-yoxsa-qadin-dusmeni/
11. https://etaist.com/xeber/35970-filosoflar-qadn-haqqnda-n-deyib-qadnn-mnas-mnszlqdr.html
12. www.anl.az>down>adelet>dekabr
13. И.С.Андреева, А. В. Гулыга, "Шопенгауэр", М. 2003, ст. 207
14. L.N.Tolstoy, "Anna Karenina", Bakı-1981, s. 400
15. http://azpress.az/index.php?lang=az&sectionid=news&id=71694

## Psychological fundamentals of the image of women and men in fiction

### Summary

The relationship and psychology of men and women is of interest to many scientists. However, it is, of course, possible to present them in a figurative, more comprehensive and meaningful way in fiction.

However, male authors often have difficulty in discovering the inner world and the psychology of women. In this regard tey face a dilemma: true exposure or fiction. Authors often use fiction to articulate and convey the author's position in an artistic way. However, there are some shortcomings in explaining the relationship between men and women. And this is often due to the fact that the authors do not completely resemble the psychology of the opposite image.

## Психологические особенности образа женщины и мужчины в художественной литературе

### Резюме

Отношения и психология женщины и мужчины превставляют интерес для многих наук. Но их изложение в переносном, более всеобьемлющем и содержательном смысле, конечно, возможно в художественной литературе.

Но часто авторы-мужчины бывают не совсем четки в раскрытии внутренного мира, психологии женщины. В этом плане они оказываются перед дилеммой: реальное изложение или художественный вымысел. Часто авторы используюут вымысел для раскрытия и донесения в художественной форме авторской позиции. Но именно в раскрытии отнешения женщины и мужчины возникают некоторые недочеты. А это часто бывает связано с тем, что авторы чаще всего не о конца проникнуты психологией противоположного образа.

**Rəyçi: dos. D.F.Hümbətova**

Göndərilib: 13.03.2020 Qəbul edilib: 17.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/21-23

**Rəfiqə Elçin qızı Seyidzadə**
Bakı Slavyan Universiteti
yusifseyidzade12@gmail.com

# AZƏRBAYCAN FOLKLORUNDA KOMİZM ELEMENTLƏRİ

***Açar sözlər:*** *qarşıdurma, gülüş, folklor, nağıl, xeyir və şər, əks, qəhrəman*
***Key words:*** *conflict, laughter, fairy tale, good and evil, opposite, folklore, hero*
***Ключевые слова:*** *противопоставление, смех, фольклор, сказка, добро и зло, воспроизведение, герой*

## Giriş

Gülüş, bədii gülüş, xalq gülüşü, gülüş mədəniyyəti kimi problemlər elmi düşüncəni müxtəlif cəhətlərdən özünə cəlb etmiş və ayrı-ayrı tədqiqatçılar həmin problemlərin elmi təhlilini aparmışdır. Gülüş iki cür mahiyyətə malikdir: mühüm magik və mifoloji. Əslində bəzən onları bir-birindən ayırmağın özü də mümkünsüzdür. Beləliklə, günəş obrazında günəşin doğmasında və batmasında gülməyin və ağlamağın təcəssümü, "Kosa-kosa" oyununda gülməli zahiri görkəmlə məzəli sözlərindən törəyən həyati oyanış, gülüşün bəladan xilasedici gücü və qəhrəmanı qəflət yuxusundan oyatmaq iqtidarı gülüşün özünü belə folklorun aparıcı qəhrəmanlarından birinə çevirir.

Xeyir və şər, ağ və qara, həyat və ölüm kimi qarşılaşmalar o qədər geniş planda və o qədər məhsuldar şəkildə öyrənilmişdir ki, bu məsələlərə şübhə ilə yanaşmağın özü belə ağıla gəlmir. İstər gülüşün mənbəyindən, istər gülüşün mahiyyətindən yazanda gülüşün həyatvericilik funksiyası əsas müddəa kimi götürülməlidir.

Azərbaycan folklorunda komizm məsələlərini düzgün istiqamətdə araşdırmaq üçün gülüşün mif və mərasimlərlə bağlılığını öyrənmək, gülüşün hansı magik mahiyyət daşıdığına diqqət yetirmək lazım gəlir. Gülüş ilk növbədə günəş obrazı ilə bağlı olub. Günün batmağından vahimələnən qədim insanlar günün çıxmağına sevinib, qaranlığı şər, işığı xeyir adlandırıb. İnsan günəşin doğmasına sevinməklə bərabər, həm də bu doğuluşun özünü bir gülüş prosesi kimi qavramağa başlayıb. Günəş tədricən gülüş rəmzinə çevrilib, tarixi-mifoloji yaddaşımıza gülən varlıq kimi həkk olunub. Günəşin bu cür gülüş rəmzi kimi qavranılması tək bizə yox, dünya xalqlarının çoxuna aid bir məsələdir.

Elmdə geniş yayılmış qənaətə görə (4; 5), ikili qarşıdurma (xoşbəxtlik-bədbəxtlik, həyat-ölüm, yuxarı-aşağı, gecə-gündüz və s.) arxaik dünyagörüş sistemində aparıcı yer tutur. Məsələn, belə hesab edilib ki, qədim türk yazılı abidələrindən olan "Fal kitab"nda yaxşı-pis, yuxarı-aşağı, kişi-qadın və s. kimi ikili qarşıdurmalar qabarıq şəkildə əks olunub. Qədim türk abidələrinin digər nümunələrində ikili qarşıdurmanın əsas yer tutduğunu inkar etmədən diqqəti başqa bir cəhətə diqqət yetirmək lazımdır: abidələrdə elə məqamlarla qarşılaşırıq ki, həmin məqamlarda ikili qarşıdurma məntiqi pozur. Məsələn, "Fal kitabı"nda hadisələr yaxşı və pis tərəflərinə bölündüyü halda, abidənin bir neçə yerində bu ölçü gözlənilmir, sadalanan müəyyən cəhətlər eyni zamanda həm yaxşı, həm də pis əlamətlər sırasına daxil edilir. Yəni abidədə yaxşı və pis hadisələrlə yanaşı, yaxşı ilə pisi birləşdirən hadisələr də diqqətə çatdırılır. Bu cür faktlar ibtidai təsəvvürlər sistemində B.Ternerin irəli sürdüyü üçlü qarşıdurma modelini nəzərə almağı bir zərurətə çevirir. B.Ternerin bir Afrika tayfası üzrə apardığı müşahidələr nəticəsində aşkar olunan "triada" sistemi arxaik dünyagörüşdə üç tərəfin qarşılıqlı nisbəti prinsipinə əsaslanır. B.Ternerin qənaətinə görə, qədim təsəvvürdə bir-birinə zidd olan ağ və qara simvolları ilə yanaşı, onların qovuşduğunu bildirən Orta qırmızı simvolu da vardır. Türk mifologiyasına görə, Yuxarı və Aşağı dünyalardan əlavə, Orta dünya da mövcuddur. Orta dünya Yuxarı ilə Aşağını birləşdirir. Yerlə göyün, kişi ilə qadının birləşməsi məhz Orta dünyaya aid olan amildir. Gur işıqla zil qaranlıq Orta dünyada adi işıqlaşma kimi meydana çıxır. Yuxarı dünyada gələcək, Aşağı dünyada keçmiş bərqərar olursa, həmin zamanlar Orta dünyada indiki zaman şəklində bir-birinə yaxınlaşır. Orta dünya dişi və erkək dəvələrin, uyuyan insanların yaşadığı bir dünyadır. "Fal kitab"nda ağ və qara rəngləri ilə yanaşı, onların qovuşduğu ala rəng də xüsusi yer tutur və ala atdan, ala quşlardan söhbət açılır. Yaxşı və pisin qovuşması abidədə altun və sarı rənglərin nümunəsində də özünü göstərir. Altun qanadlı qartalın ovu caynağına keçirməsi, altun nallı dəvənin doğması yaxşı əlamət sayıldığı halda, altun başlı ilanın qursağının qılıncla doğranması pis əlamət sayılır. Deməli, altun və sarı rənglər həm yaxşı, həm də pisin simvolu kimi özünü göstərir.

Əski türk mifologiyasında rast gəldiyimiz Orta dünya təsəvvürü öz izlərini xalq gülüşündə qabarıq şəkildə saxlayıb. Xalq gülüşündə tənqid edənlə tənqid olunan eyni oyunun oyundaşlarıdır. Kələkbazlıq və axmaqlıq müsbət və mənfini, yaxşı və pisi öz qoynuna alaraq birləşdirir. Komik folklor nümunələrində padşah, qazı və

tacir zalım, xəsis və axmaq sifətində təqdim edildiyi kimi, Molla Nəsrəddin və keçəl də müsbətlik mücəssəməsi deyil. Molla Nəsrəddin bəzən uşağa belə aldanan axmaq, bəzən isə xəsis bir kələkbazdır. Həm yuxarı, həm aşağı təbəqə nümayəndələrinə qarşı kələk işlədən keçəl "mütləq xeyir" qəliblərinə sığmır.

Müşahidə etdiyimiz arxaik qarşıdurma tipinin folklorda ifadəsini daha konkret təsəvvür etmək üçün heyvanlarla bağlı nağıllar üzərində dayanmaq yerinə düşərdi. Biz, adətən, nağıllarda qəhrəmanların hərəkətlərini xeyirlə şərin mübarizəsi, xeyirin şər üzərində qələbəsi kimi qiymətləndiririk. Heyvanlar aləmindən bəhs edən nağılların bir çoxunda isə hansı heyvanın xeyir, hansı heyvanın şər təmsilçisi olduğunu söyləmək müşkülə dönür. Bu nağıllarda mübarizə xeyirlə şərin mübarizəsindən daha çox, hiyləgərin maymaqla mübarizəsi şəklində ortaya çıxır. Məsələn, "Tülkü, tülkü, tünbəki" nağılında xeyirlə şərin mübarizəsini axtarsaq, onda yəqin ki, tısbağa xeyirin təmsilçisi kimi qəbul edilməlidir və məlum məntiqə görə, nağıl onun qələbəsi ilə sona çatmalıdır. Lakin nağılın məzmunundan bəlli olduğu üzrə, quyu dibinə düşüb çıxılmaz vəziyyətdə qalan heyvanlar arasında hamıdan əvvəl uduzan tısbağa olur. Ona görə də "Tülkü, tülkü, tünbəki" tipli nağıllarda konflikt xeyirlə şər arasında yox, ağıllı ilə axmaq arasında axtarmaq lazım gəlir.

Komik folklor süjetlərində tez-tez rast gəldiyimiz kələkbazlar müxtəlif qütblər arasında kəskin ayrılığı aradan qaldıran obrazlardır. Levi-Stross və E.M.Meletinski bu baxımdan qarğanı yerlə göyün, ölümlə həyatı qovuşduran, onlar arasında ortaq mövqe tutan səciyyəvi obraz hesab edirlər. Ölüm və həyat qütblərinin bir-birinə yaxınlaşması və qovuşması kimi xüsusi hal heyvanlar aləmindən bəhs edən nağıllarda aydın şəkildə nəzərə çarpır. Müqayisə üçün qeyd edək ki, baş qəhrəmanın ölümü sehrli nağıllar üçün səciyyəvi deyil. Çünki sehrli nağılların semantikasına görə, ölümlə həyat, xeyirlə şər kimi barışmazdır; barışmaz mübarizədə şər ölümə məhkumdur və şəri ölümə yuvarladan xeyir son anda xoşbəxtlik qazanmalıdır. V.A.Baxtina heyvanlarla bağlı nağıllarda ölüm və həyatın nisbəti barədə yazır: "Xoşbəxt sonluqla bitməsə də, heyvanlar haqqında nağıllar tragik ovqatdan uzaqdır və əhvalatların hər hansı şəkildə bitməsi bu nağıllarda adi bir haldır. Bu nağıllarda həyat-ölüm fəlsəfəsi heyrətamiz dərəcədə müdrik və təbiidir. Həyatı bu yöndə dərk etmək xalqın kollektiv gücünü və müdrikliyini, heyvanlar haqda nağılların isə qədimiliyini göstərir". Bu xüsusiyyətlər heyvanlarla bağlı Azərbaycan nağılları üçün də səciyyəvidir. Azərbaycan folklorunda heyvanlar aləmindən bəhs edən nağıllar içərisində xoşbəxt sonluqla bitməyən, amma nikbin məzmun daşıyan nağıllardan biri "Pıspısa və Siçan bəy"dir (3). Azərbaycan folklorunda məhəbbət motivli nağılların heç birində aşiq naz-qəmzə satan sevgilisini öldürmür. Bu nağılda isə vəziyyət başqa cürdür. Düzdür, Siçan bəy də Pıspısa xanıma vəfalıdır. Onun dəvə izi qədər dərin gölə düşdüyünü eşidən kimi hadisə yerinə tələsir. Amma Pıspısa xanımın naz edib əlini Siçan bəyə verməməsi ölümlə nəticələnir. Siçan bəy acıqlanır və bir ovuc palçığı götürüb Pıspısa xanımın başına çırpır. Dozanqurdunun elə ordaca canı çıxır. Vəssəlam. Nağıl beləcə sona yetir və Pıspısa xanımın bu ucuz ölümü tragiklik yox, komiklik yaradır. Əzilib–büzülməkdən, nazlanmaqdan savayı əlindən bir iş gəlməyən, üstəlik çalışıb-vuruşanın yolunda əngələ dönən Pıspısa xanımın ölümü adi və təbii bir hal təsiri bağışlayır. Əxlaqi ölçülərlə yanaşdıqda, Pıspısa xanım və Siçan bəyi insanları təmsil obrazlar kimi təsəvvür etdikdə, kiçicik bir səbəb üstündə adam öldürmə ifrat mənfilik sayılmalıdır. Lakin bu cür yanaşma üsulu kökündən səhvdir. Çünki bu sayaq nağıllarda heç də müasir insan həyatı yox, heyvanlarla bağlı arxaik dünya təqdim olunur. Bu elə bir dünyadır ki, orada birinin ölümü digərinin həyatı üçün başlanğıcdır. Yeri gəlmişkən deyək ki, "Pıspısa xanım və Siçan bəy" nağılı əsasında çəkilmiş cizgi filmində Pıspısa xanım öldürülmür. O, acıq edib üz çevirmiş Siçan bəyin quyruğundan tutub sudan çıxır. Yəqin ki, filmin müəllifləri nağılın özündəki sonluğu müasir düşüncə tərzi üçün uyğun bir variant saymayıblar. Və, məncə, müasir bədii düşüncə baxımından uğurlu sonluq tapıblar.

Azərbaycan folklorunda "Şəngülüm, Şüngülüm, Məngülüm" tipli nağıllar, rusların "Canavar və keçi" nağılında olduğu kimi, sehrli nağıllarla səsləşir. Çünki "Şəngülüm, Şüngülüm, Məngülüm" nağılı məhz xeyirlə şərin mübarizəsi üzərində qurulub. Küçi ilə balaları xeyiri, canavarsa şəri təmsil edir. Sehrli nağıllar kimi, bu nağılların da müsbət qəhrəmanları ölümdən uzaqdır.

Kələkbazlıq və axmaqlıq motivi heyvanlar aləmindən bəhs edən nağıllara xüsusi komiklik gətirir və əks qütblərin yaxınlaşma və qovuşmasında, eyni bir aləmin fiqurlarına çevrilməsində hoqqabazlıq mühüm rol oynayır.

Heyvanlar haqqında nağıllarda gülüşün mahiyyəti araşdırılarkən mübahisə doğuran cəhətlərdən başlıcası sosial satira məsələsi ilə bağlıdır. Bir çox folklorşünaslar belə hesab edirlər ki, heyvanlar aləmindən bəhs edən nağıllarda heyvanlar bir bəhanədir və müxtəlif heyvan surətləri vasitəsilə insanlar təsvir olunur. Heyvanlar haqqında nağılları təmsil və alleqoriya kimi qiymətləndirən folklorşünaslar bu nağıllarda müxtəlif heyvanların davranışlarını ictimai həyatın ayrı-ayrı lövhələrinin ifadəsi kimi qəbul edir. Heyvanlar haqqında nağıllarda sosial həyatın qabarıq ifadəsini axtaran folklorşünaslar bu nağılların komikliyinə də sosial ədalətsizliyi tənqid və ifşa etməyin bir yolu kimi baxırlar.

Heyvanlar haqqındakı nağıllarda canavar, keçi, tülkü, dəvə və s.-nin insana xas əlmətlərlə çıxış etməsi əski çağlardan gələn məlum ibtidai təsəvvürlərin məhsuludur: insan özünü təbiətdən ayırmır, təbiət, o cümlədən heyvanlar insana xas əlamətlərlə çıxış edən varlıq kimi dərk olunur.

Heyvanlar haqqındakı nağılların heyvanlarla bağlı arxaik görüşləri ifadə etdiyini aydın şəkildə nəzərə çarpdırmaq üçün bu folklor nümunələrini yazılı ədəbiyyatdakı alleqorik əsərlərlə müqayisə etmək faydalı olardı. Q.Zakirin "Sədaqətli dostlar haqqında" adlı təmsilində tısbağa, qarğa, kəsəyən və ahunun dostluğundan, onların bir-birlərinə möhkəm sədaqət nümayiş etdirməsindən bəhs olunur. Dostlardan biri dara düşəndə digəri əlindən gələn son köməyi əsirgəmir. "Dost dosta tən gərək" nağılında isə şir, qurd və tülkü arasında dostluq heç də bir-birinə sədaqət şərtinə əsaslanmır. Q.Zakirin misal gətirdiyim təmsili ilə "Dost dosta tən gərək" nağılı arasında başlıca fərq ondadır ki, birinci nümunədə heyvanlar insanları təmsil edir, ikinci nümunədə isə heyvanlar məhz heyvanların özlərini təmsil edir.

Q.Zakirin "Sədaqətli dostlar haqqında" təmsili əxlaqi normalara əsaslanır və didaktik məqsəd daşıyır. Əxlaqi normalara görə, dostun biri dardadırsa, o biri köməyə gəlməlidir (3, 57).

Deyilənlərdən aydın olur ki, komik nağıllarda xeyir və şərin mövqeyi komik olmayan nağıllardakı mövqeyindən fərqlənir. Komik nağıllarda xeyir və şər arasındakı sədlər xeyli dərəcədə azalır, pislə yaxşı bir-birinə qovuşur və onları bir-birindən ayırmaq çətinləşir. Xeyirlə şərin, pislə yaxşının qaynayıb-qarışması bütövlükdə xalq gülüşü üçün səciyyəvi bir əlamət kimi özünü göstərir.

## Ədəbiyyat

1. Azərbaycan nağılları. 5 cilddə, V cild, Bakı, Elm, 1964.
2. Azərbaycan nağılları. 5 cilddə, II c. Bakı, Elm, 1961.
3. Fərzəliyev T. Lətifələrdən yazılı ədəbiyyatda istifadə. Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər. IV kitab. Bakı, Elm, 1973.
4. Бахтин М.М. Творчество Франсуа Рабле и народная культура средневековья и ренессанса. М.: Худ. лит, 1965.
6. Hüseyn Orkun. Əski türk yazıları. Ankara, 1987.
7. Azərbaycan folkloru antologiyası. 2 kitabda. I kitab, Bakı, Elm, 1968.

## Elements of humorous in azerbaijani folklore

**Summary**

In order to accurately study the problems of comedy in Azerbaijani fairy tales, it is necessary to study the connection between myths and rituals of laughter, to pay attention to the magical nature of laughter. In folklore, laughter was primarily associated with the image of the sun. In Azerbaijani folklore, critics and critics sometimes unite to some extent. Fraud and stupidity comb

ine positive and negative, good and bad. Molla Nasreddin and Lysy criticize the negative aspects of society, but they themselves are not always the embodiment of the positive. Molla Nasreddin is sometimes stupid, sometimes harmful, and sometimes simple-minded. Similarly, Lysy does not fit the words "absolutely good".

## Элементы комизма в азербайджанском фольклоре

**Резюме**

Для четкого изучения проблем комизма в азербайджанском фольклоре необходимо изучить связь мифов и ритуалов смеха, обратить внимание на магическую сущность смеха. Смех в фольклоре первично был связан с образом солнца. В азербайджаком фольклоре критикуемый и критикующий, порой, сливаются в один образ. Мошенничество и глупость сочетают в себе положительное и отрицательное, хорошее и плохое. Так, Молла Насреддин и Лысый критикуют негативные стороны общества, но они и сами не всегда являются воплощением позитива. Молла Насреддин - это иногда глупый, а иногда и вредный, а иногда простодушен. Точно также и Лысый не вписывается в слова «абсолютное благо».

**Rəyçi: dos. D.F.Hümbətova**

Göndərilib: 14.03.2020 Qəbul edilib: 18.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/24-26

**Zərifə Bayram qızı Məmmədova**
**Zərifə İsmayıl qızı Avilova**
Azərbaycan Tibb Universiteti

# DİLİN İNKİŞAFINDA DİLLƏRİN QARŞILIQLI ƏLAQƏSİNİN ROLU

***Açar sözlər:*** *dil, dillərin əlaqəsi, dilin inkişafı, dilin zənginləşməsi, dilin təkmilləşməsi*
***Key words:*** *language, language ties, language development, language enrichment, language improvement*
***Ключевые слова:*** *язык, языковые связи, развитие языка, обогащение языка, совершенствование языка*

## Giriş

Dilin inkişafı onun öz funksiyalarını necə yerinə yetirə bilməsindən asılıdır. Əgər dil hər hansı bir funksiyanı yerinə yetirmirsə, onda həmin istiamətdə inkişaf prosesi dayanmış olur. Məişət dili səviyyəsində işlənmə, təbii ki, elmi və rəsmi üslubların inkişaf etməməsi ilə şərtlənir. Bu halda dil müxtəlif elm sahələri üçün metadil funksiyasını itirir. Aydındır ki, metadil funksiyasını yerinə yetirməyən dil müəyyən sahəyə aid anlayışların izahını və ifadəsini mövcud olan bütün əşya və anlayışları ifadə edə bilməlidir. Dilin kamilliyi həmin anlayışların necə ifadə olunmasından asılıdır.

Bəzən dil yalnız özünə aid vahidlərin köməyi ilə anlayışın məzmununu verə bilmir. Bu halda bir dil başqa dilin imkanlarından istifadə etməli olur. Təsadüfi deyil ki, dillərin qarşılıqlı əlaqəsində tərcümə prosesi mühüm rol oynayır. Tərcümə zamanı mənbə və obyekt dillərin qarşılaşdırılması hadisəsi baş verir. Mənbə dildəki məlumatın obyekt dildə ifadə olunması iki dilin imkanlarını müqayisə etməyə zəmin yaradır. Tərcümə prosesində obyekt dildə təkcə söz, yaxud leksik vahidlərin çatışmazlığı məsələsi deyil, dilin ayrı-ayrı ünsürlərinin, vahidlərinin işlənmə məqamları, formaları aşkara çıxır. Dillərin müqayisəli tədqiqi onların inkişaf səviyyələri haqqında müəyyən məlumatlar əldə etməyə imkan versə də, nəticə etibarı ilə bu, konkret dilin zənginləşməsi, təkmilləşməsi və inkişafının xüsusiyyətlərini açmır. Dilin inkişafı onun müxtəlif dövrlərdəki vəziyyətinin müqayisəsinə əsasən aparılmalıdır. Lakin burda meydana çıxan çətinlik müvafiq dövrləşdirilmənin aparılması ilə bağlıdır. Dövrləşdirmə bilavasitə dil tarixinin problemi kimi meydana çıxır. "Ümumiyyətlə, dilin tarixini və ya onun hər hansı bir səviyyəsini, hər hansı bir kateqoriyasını dürüst və dəqiq öyrənmək üçün dildən ünsiyyət vasitəsi kimi istifadə edənlərin tarixini tədqiq etmək zəruridir" (1, 3).

Dillərin qarşılıqlı əlaqə və münasibətləri hələ qədim zamanlardan, hətta ibtidai icma quruluşu dövründən başlayaraq mövcud olmuş, tayfa, qəbilə, icma ittifaqları və eləcə də onların şuralarının yaranması ilə eyni bir dövrə təsadüf etmişdir. Çox güman ki, bu dövrdə bəsit şəkildə olsa da, dil ittifaqlarının yaranması dil əlaqələrinin, ikidillilik, bəlkə də çoxdillilik təşəkkül tapması tarixi bir zərurət kimi meydana gəlmişdir. İnsan cəmiyyətinin inkişafı prosesində xalqlar və onların dilləri bir-biri ilə daim əlaqədə olur. Dünyada başqa xalqlardan tam təcrid olunaraq yaşamış xalq təsəvvürə gətirmək çətindir. Xalqların həyatında dil əlaqələrinin rolu inkaredilməz dərəcədə böyükdür. Onların digər əlaqələri də məhz insan cəmiyyətinin ən mühüm ünsiyyət vasitəsi olan dil əsasında yaranır və inkişaf edir. Buna görə də dil əlaqələrinin xalqlar və millətlər arasındakı digər əlaqələrdən ayırmaq mümkün deyil.

Xalqlar arasında mövcud olan müxtəlif əlaqələr və xüsusilə dil əlaqələri daha çox ictimai səciyyə daşıyır. Hər hansı bir dilin müxtəlif qatlarının inkişafının müəyyən mərhələlərində baş verən bu və ya digər dəyəşikliklər onun yalnız daxili inkişaf qanunları ilə məhdudlaşmır.

Dil əlaqələri dil tarixinin mərkəzi problemlərindən biridir. Qohum dillərin və onlarla həmsərhəd mövqedə yayılan qohum olmayan dillərin qarşılıqlı təsiri iqtisadi və mədəni əlaqələr zəminində təşəkkül tapır. Bu təsir əlaqədə olan dillərin hər birində və dilin bütün struktur səviyyələrində özünü göstərir. Bilavasitə dil əlaqələri ilə bağlı problemlərə həsr olunmuş elmi ədəbiyyatlarda göstərilən fikir təsdiqlənir (2; 3). Dil əlaqələri zəminində dillərin bir-birinə təsiri məsələlərinin araşdırılması istiqamətlərini təyin etməyə çalışaq. Aydındır ki, dil əlaqələri prosesində qohum dillər də iştirak edə bilər. Xüsusi halda əlaqələr qarışıq xarakterli, yəni eyni zamanda həm qohum, həm də qohum olmayan dillərin əlaqəsinə rast gəlmək olar. Dil əlaqələrinin üç növünü müəyyənləşdirmək mümkündür:

- qohum dillər arasında əlaqələr;
- qohum olmayan dillər arasında əlaqələr;
- qarışıq əlaqələr.

Birinci tip əlaqələr şifahi danışıq, eləcə də müasir dövrdə radio, televiziya və dublyaj olunmamış filmlər əsasında baş verərək çox geniş yayılmış əlaqə növlərindən biri sayılır.

İkinci tipi isə yazılı ədəbiyyat, bəzi hallarda isə tədris və yazışmalar əsasında yaranır. Başqa xalqların ədəbiyyatını onun dilində oxumaqla insanlar əslində istər-istəməz həmin dillə də əlaqəyə girirlər.

Kontaktsız ikidillilik ikinci dili xüsusi öyrənmək yolu ilə baş verir.

“Kontaktlı ikidillilikdə bütöv etnik qruplar və xalqlar ikidilli ola bildiyi halda, kontaktsız ikidillikdə yalnız ayrı-ayrı şəxslər və sosial qruplar ikidilli ola bilər” (4, 107-108).

Dillərin qarşılıqlı əlaqə və münasibətləri nəticəsində yaranan ikidillilik və çoxdillilik də əsasən xalqların bilavasitə uzunmüddətli qonşuluqları və ya eyni ərazidə birgə yaşamaları, həmçinin geniş iqtisadi, siyasi, mədəni və s. əlaqələri (bir yerdə işləmələri, oxumaları, yaşamaları və s.) ilə sıx bağlıdır. Dillər arasında mövcud olan belə bir prosesin səciyyəvi cəhətlərini göstərməklə yanaşı, ikidilliliyin iki tipini də fərqləndirmək lazımdır- regional (məhəlli) və milli. Məhəlli ikidillilik inzibati-dövlət, yaxud coğrafi prinsip üzrə hüdudlanan müəyyən bir ərazidə iki yaxud daha çox miqdarda dilin mövcud olması zamanı özünü göstərir. Bu mənada keçmiş Sovet İttifaqı, Çin, Hindistan, İndoneziya, Belçika, İsveçrə, Kanada və s. Ikidilli yaxud çoxdilli dövlətlərdir.

Milli ikidillilik coğrafi (ərazi) prinsipə deyil, etnik (milli) prinsipə əsaslanır. Belə ikidillilik bir xalqa iki, yaxud daha çox müxtəlif milli dillərin yanaşı yaşaması zamanı baş verir.

Bir dilin vahidləri əlaqədə olduğu dilə heç də ucdantutma keçmir və buna ehtiyac da duyulmur. Çünki bu proses ehtiyacdan irəli gəlir. Bir dil başqa dilin ünsürlərini, ilk növbədə ehtiyac nəticəsində, özündə olmadığına görə alır. Bunun şərtlərindən əsas məsələlərindən biri, deyək ki, başlıcası xalqlardakı ümumi cəhətlərlə yanaşı, hər bir xalqın özünəməxsus maddi və mənəvi mədəniyyətlərə, milli dünyagörüşü və təfəkkürə, elmi-texniki tərəqqiyə malik olmasıdır. Elə buna görə də əlaqədə olan xalqlardan hər hansı birindəki bütün əşya və məfhumların heç də hamısı digərində təkrarlanmır. Bu fərqlər öz əksini əşya və məfhumların real ifadəçisi olan dillərdə tapır. Bunun üçündür ki, əlaqədə olan dillər ünsiyyət vasitəsi rolunu tam yerinə yetirmək üçün, ilk növbədə, biri digərindən özündə olmayan vahidləri alır və bu yolla da öz funksiyasını yerinə yetirməyi təmin edir.

Əlaqədə olan dillər bir-birindən, ilk növbədə, ehtiyyac duyduqlarını, ünsiyyət təmin edə bilmək üçün özündə olmayanları alır.

Araşdırmalardan aydın olur ki, xalqlar arasında baş vermiş dil əlaqələri, ikidillilik və çoxdillilik genişlənib inkişaf etdikcə təsirin və bu təsir nəticəsində bir dildən başqa dilə keçən alınmaların xarakteri də dəyişir. Onlar getdikcə artır, çoxalır və dərinləşir. Bu prosesdə ilk növbədə dil əlaqədə olduğu dildən ehtiyac duyulan, özündə olmayan vahidləri alırsa, sonralar özününküləri dəyişdirmək, ağır tələffüz olunanları yüngülləri ilə variantlar, substitullar və s. artır. Deməli, leksik alınmaların tədqiqi zamanı göstərilən məsələlər diqqət mərkəzinə çəkilməli, bu və ya digər sözün alınma səbəbləri də araşdırılmalıdır.

Dil əlaqələrinin tipləri və növləri, onların təzahür formaları fərqləndiyindən bu əlaqələrin konkret dilə təsiri də müxtəlif şəkillərdə özünü göstərir.

Əlaqədə olan dillərin heç də hamısı bir-birinə eyni dərəcədə təsir etmir. Birinin o birinə və ya əksinə təsiri az və ya çox ola bilər. Belə ki, bu əlaqələrin geniş yayıldığı areallarda dillərdən əksər hallarda biri tarixən mənsub olduğu qrupun cəmiyyətdəki vəziyyətindən, onun ictimai, iqtisadi, siyasi, mədəni, elmi-texniki və s. inkişaf səviyyəsindən asılı olaraq aparıcı mövqeyə malik olur, aşağı səviyyədə inkişaf etmiş xalqların dillərinə güclü təsir edir. Buna ən parlaq misal yazılı dillərin yazısız dillərə təsiridir.

Siyasi münasibətlər müstəvisində, verilmiş vahid məkan daxilində müxtəlif dillər arasında iyerarxik yerləşmə mümkün və labud haldır. Bu halda dillərdən biri digəri ilə müqayisədə dominant mövqedə durur. Dövlət dili, yaxud verilmiş ərazidə aparıcı dil olma daha sürətlə inkişaf etməyə imkan yaradır.

Şübhə yoxdur ki, göstərilmiş qanunauyğunluqların müasir səviyyədə inkişafı, geniş şəkildə fəaliyyəti üçün konkret ərazi və bölgələrdə tarixən yaranıb inkişaf edən, genişlənən ekstralinqvistik və linqvistik əlaqələrin, eləcə də bu əlaqələrin səciyyəvi tipi kimi özünü göstərən ikidillilik və çoxdilliliyin meydana gəlməsi üçün baza olan dillərin sosiolinqvistik və linqvistik funksiyalarının öyrənilməsinin, leksik alınmaların törənmə səbəblərinin, onların spesifik xüsusiyyətlərinin araşdırılması çox böyük əhəmiyyət kəsb edir.

Çoxdillilik şəraitində dil əlaqələrinin tədqiqi daha mürəkkəb problemi əhatə edir.

Çoxdillilik ilə üç və daha artıq dilin kontaktlı əlaqəsi anlayışı eyniləşdirilməməlidir. Terminoloji məna nöqteyi-nəzərindən bunlar bir-birindən fərqli cəhətlərə malikdir. Çoxdillilik kontaktlı əlaqə olmadan da reallaşa bilir. Bu baxımdan üç və daha artıq dilin kontaktlı əlaqəsi daha geniş məzmun kəsb edir və çoxdillilik onun xüsusi halına çevrilə bilər. Üç və daha artıq dilin kontaktlı əlaqəsi arealında çoxdillilik daha geniş miqyaslı olur və bu prosesdə müxtəlif dil daşıyıcılarının əksəriyyəti iştirak edir. Əksəriyyətin iştirak etdiyi prosesin özü isə böyük təsir gücünə malikdir. Buradan belə nəticə çıxır ki, dil əlaqələrinin öyrənilməssi bu əlaqələrin formalarını da nəzərə almağı tələb edir.

The case law is hard to reconcile. Judges and jurists disagree as to the effect of mistake of identity upon the formation of a contract. This disagreement extends beyond discordance as the operative principles to the very existence of the doctrine. The problem of mistake of identity almost on every occasion takes the same form. A wrongdoer practises a deception cleverly to convince an innocent person [9, p.711]. Mistake of identity cases are consistently cases of unilateral mistake and this type of mistake is brought by the deliberate deception of the other contracting party. These cases are peopled with rogues, swindlers and cheats determined to wrongfully acquire the goods of another [9, p.712].

Mistake as to identity emerges when one party – occasionally deluded by a "rogue"–believes themselves to be haggling with another, uninvolved, third party. In this specific situation of this kind, the contract will either be void for mistake, or voidable for fraud. This distinction depends on by which method contract was made. Two types of contract exist: a) Contract made *inter absentes*, when the parties do not negotiate face-to-face, e.g. through correspondence. The prominent cases related to inter absentes are *Cundy v Lindsay [1878]*; *King's Norton Metal Co v Edridge Merrett & Co [1897]; Shogun Finance Ltd v Hudson [2004]* and, b) Contract made *inter praesentes* - when the parties meet face-to-face. The famous cases related to inter praesentes are *Phillips v Brooks [1919]; Ingram v Little [1961]; Lewis v Averay [1971]*. Macmillan describes: "There are few more vexed areas of contract law than mistake of identity." English contract law provides less protection for purchaser from rogue than American law [6].

It is noteworthy, to analize mistake as to the identity of a party with several *cases. The standard case* is one in which one party, X, concludes a contract with Y in the fallacy that Y is in fact Z. The mistake of X is typically prompted by Y's fraudulent representation that he is Z. Whether X's mistake causes to be the contract between himself and Y void? This question does not have a simple and exact answer. By and large, the answer is related to whether the contract between X and Y has been diminished to writing. Where the contract has been diminished to writing, and the written agreement states that the parties to it are X and Z, then the authorities offer that the contract between X and Y may indeed be invalidated for mistake. But where the contract between X and Y has been made orally in face-to-face (inter praesentes) dealings then X is improbably to succeed in his claim that the contract is void for mistake because, in such a case, the law accepts that X intended to contract with the person who was actually in front of him (i.e. Y) and that presumption is very difficult to refuse [10, p.526].

***Cundy v Lindsay* (1878)**

The beginning of mistake to identity is bearing a relation with this case. This is an English contract law case introducing the concept that contracts could be automatically void for mistake to identity, where it is of significant importance. The case said to establish the doctrine of mistake of identity [8, p.230].

According to the facts of the case, Lindsay & Co were manufacturers of linen handkerchiefs, amongst other things. They received correspondence from a man named Blenkarn. He had rented a room at 37 Wood Street, Cheapside, but purported to be 'Blenkiron & Co'. Lindsay & Co knew of a reputable business of this name which resided at 123 Wood Street. Believing the correspondence to be from this company, Lindsay & Co delivered to Blenkarn a large order of handkerchiefs. Nevertheless, he never paid for them and instead sold them to the defendant - an innocent third party, Cundy. That is why, Lindsay & Co sued Cundy for conversion of goods [4]. If the contract was invalid, title in the goods would not pass to the rogue, so the defendants have no title the goods. Ownership of the goods would remain with the plaintiff.

Held: The court stated that the contract was void for unilateral mistake as to the identity and the claimant was able to demonstrate an identifiable existing business with whom they intended to contract with. The defendant was held liable for conversion [7].

***Shogun Finance LTD v Hudson* (2003)**

Facts: A rogue purchased a car on HP terms from a car dealer. He had produced a stolen driving licence in the name of Durlabh Patel. The car dealer faxed the driving licence to the plaintiff Shogun Finance LTD. The dealer wrote out the hire-purchase contract in the name written on the license. The claimant then did a credit search on Patel A rogue then sold it on to the defendant - Hudson and defaulted on the finance agreement. The claimant brought an action against the defendant claiming to be the owner of the car as the contract was void for mistake to identity. Hudson counterclaimed, claiming to have the title to the vehicle.

Held by 3-2 decision: The defendant's appeal was dismissed. The contract was void for mistake to identity. The contract concluded between the finance company and the rogue was made inter absentes. The identity of the person was crucial to the contract as that it was Durlabh Patel that the credit check was carried out on. Hudson was required to return the car to Shogun [7].

***Phillips v Brooks LTD* (1919)**

Facts: Phillips was a jeweller. The fraudster purchased some items from the claimant's shop claiming to be Sir George Bullogh. He paid by cheque and persuaded the jewellers make an allowance for him to take a ring and claimed that he needs to give it immediately for his wife's birthday. He gave the address of Sir George Bullogh. Actually, Phillips knew of Bullough and knew he lived at the address. The rogue then pawned the ring at the bona fide third party – Brooks LTD in the name of Mr. Firth. He then disappeared without a trace.

Held: The court stated that the contract was not void. There was no mistake as to identity due to the fact this contract was made face-to-face. In this case, the law assumes they intend to deal with the person in front of them not the person they claim to be. The jewellers were unable to demonstrate that they would only have sold the ring to Sir George Bullogh. Bona fide third-party meaning Brooks Ltd was the legal owner of the ring [7].

## Conclusion

Taking everything into account, the mistake as to the identity of a contracting party acts as one of the basic grounds for the invalidity of a contract. A mistake of identity prevents the formation of a contract or renders it void when it has essential importance with the subject-matter. Needless to say, mistake of identity has gone through various development stages and new doctrine was established due to the works of famous lawyers and judgments of the courts. Up to appoint, it had a weak base in the case law, but later courts accepted this doctrine. This type of material mistake is covered by the up-to-date legislations of different countries. All the essential elements should be proved by the claimant in order to create an operative identity mistake.

## Literature

1. Azərbaycan Respublikasının Mülki Məcəlləsi. http://www.e-qanun.az/code/8
2. Allahverdiyev S.S. Azərbaycan Respublikasının mülki hüquq kursu. I cild. Ümumi hissə. Bakı, "Digesta" nəşriyyatı, 2008. 944 s.
3. Amiranashvili G. Mistake as to the Identity of a Contracting Party – Historical Origins and Contemporary Expressions. Journal of Law №1, 2014. pp.55-63
4. https://en.wikipedia.org/wiki/Cundy_v_Lindsay
5. https://en.wikipedia.org/wiki/Mistake_(contract_law)
6. https://en.wikipedia.org/wiki/Mistake_in_English_contract_law
7. http://www.e-lawresources.co.uk/cases/
8. MacMillan C. Mistakes in Contract Law. "Hart Publishing", 2010. 349 p.
9. MacMillan C. Rogues, Swindlers and Cheats: The Development of Mistake of Identity in English Contract Law. *The Cambridge Law Journal*, Vol. 64, No. 3 (Nov., 2005), pp. 711-744
10. McKendrick E. Contract Law: Text, cases and materials. "Oxford University Press", 2012. 1092 p.
11. Spark G. Mistake as vitiating factor in English contract law. University of Cambridge Faculty of Law Research Paper No. 22/2011. 16 p.
12. Новицкий И.Б. Сделки. Исковая давность. Москва, "Госюриздат", 1954. 248 с.

## Kontragentin şəxsiyyəti barəsində yanılma vacib əhəmiyyətli yanılmanın bir növü kimi

### Xülasə

Müqavilə tərəflərin hüquq bərabərliyinə, iradə ifadəsinə və qarşılıqlı razılığına əsaslanır. Amma bəzən elə hallar meydana gəlir ki, məsələn, yanılma nəticəsində iradəsi qüsurlu olan müqavilələr yaranır və bu da onların etibarsızlığına səbəb olur. Azərbaycan Respublikasının Mülki Məcəlləsinə əsasən kontragentin şəxsiyyəti barəsində yanılma da müqavilənin etibarsızlığı əsaslarından biri kimi çıxış edir və vacib əhəmiyyətli yanılmanın bir növü kimi qəbul edilir. Kontragentin şəxsiyyəti barədə yanılma hələ Qədim Roma dövrlərindən başlayaraq inkişaf yolu keçmiş və ingilis ümumi hüququnda bir doktrina kimi təşəkkül tapmışdır. Xüsusilə qeyd etmək lazımdır ki, presedent hüququ kontragentin şəxsiyyəti barədə yanılmanı formalaşmasında böyük rol oynamış və onu daha yaxşı analiz etməyə imkan yaratmışdır.

**Заблуждение в отношении личности контрагента как вид существенного заблуждения**

**Резюме**

Договор основан на правовом равенстве, волеизъявлении и взаимном согласии сторон. Одноко иногда бывают случаи, когда, например, заблуждение приводит к появлению контрактов имеющих упречная воля и вызывает их недействительности. Согласно Гражданскому Кодексу Азербайджанской Республики, заблуждение в отношении личности контрагента также является одним из оснований недействительности договора и принимается как вид существенного заблуждения. Заблуждение в отношении личности контрагенра развивалось с древнеримских времен и стало доктриной в английском общем праве. Особенно следует отметить, что прецедентное право сыграло важную роль в формировании заблуждения в отношении личности контрагента позволило лучше анализировать его.

**Rəyçi: prof.Ş.Səmədova**

Göndərilib: 12.03.2020 Qəbul edilib: 14.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/39-42

**Aysel Fəzail qızı Zeynallı**
Bakı Dövlət Universiteti
aysel.z97@mail.ru

# MÜLKİYYƏTİN MÜQAVİLƏ REJİMİNİN ANLAYIŞI VƏ MƏZMUNU

***Açar sözlər:*** *ailə, hüquq, əmlakın müqavilə rejimi, əmlakın qanuni rejimi, boşanma, ər-arvad, əmlak münasibətləri, mülkiyyət hüququ*
***Key words****: family, law, property contract mode, legal of the property mode divorce, husband and wife, property relations, property rights*
***Ключевые слова****: семья, закон, имущественный договор режим, правовой режим собственности развод, муж и жена, имущественные отношения, права собственности*

Ailə - nikah və ya qan qohumluğuna əsaslanan, məişət ümumiliyi və qarşılıqlı mənəvi məsuliyyətlə bağlı olan kiçik sosial birlikdir. O, hər bir cəmiyyətin sosial strukturunun mühüm komponenti olub, çoxlu sosial funksiyalar yerinə yetirməklə həmin cəmiyyətin inkişafında mühüm rol oynayır. Nikah ailənin hüquqi əsasıdır. O, qadınla kişi arasında rəsmi qaydada bağlanılan hüquqi əqddir. Azərbaycan Respublikasının Konstitusiyasının 17-ci maddəsinə görə "Cəmiyyətin əsas özəyi kimi ailə dövlətin xüsusi himayəsindədir".

Tarixən ailə qanunvericiliyində nikah müqaviləsi institutunun yaranması xüsusi mülkiyyətin yaranması ilə əlaqələndirilmişdir. Nikah müqaviləsi hələ Roma hüququndan məlum idi. Tarixən xarici ölkələrin qanunvericiliyində nikah müqaviləsinin meydana çıxması, kapitallarını kənar müdaxilələrdən qorumaq üçün varlı siniflərin ehtiyacı ilə əlaqədar idi. Nikah müqaviləsinin tətbiqinin əsas səbəbi qadının və qohumlarının nikahdankənar mülkiyyəti idarə etmək və bu əmlakdan əldə edilən gəlirdən istifadə etmək hüquqlarını qorumaq ehtiyacı idi.

Nikah müqaviləsindən bəhs edən ən qədim mətn eramızdan əvvəl IV əsrdə Misirdə yaradılıb. Bu, "Ptaxotepin təlimləri", Köhnə Padşahlıq dövründə papirus üzərində yazılmış mətnlərdir. Misirdə nikah müqaviləsi bir qayda olaraq, birgə mülkiyyət hüququnu təmin edirdi. Bundan əlavə, boşanma zamanı ümumi birgə əmlakın üçdə biri qanuni olaraq arvada verildi. Nikah müqailəsi hakim vəzifəsini yerinə yetirən fironun qubernatoru "Jati" tərəfindən təsdiq edilirdi. Jati, müqaviləni arvadın saxlanılması üçün ərinin məsuliyyəti nəzərdə tutulduqda və arvadın cehizi ətraflı şəkildə təsvir edildikdə təsdiq edirdi (boşanma halı üçün). Müqavilə 6 şahid tərəfindən təsdiq edilirdi. Yeni Padşahlıq dövründə (e.ə II-I əsrlər) hətta qadın da boşanma üçün müraciət edə bilərdi.

Nikah müqavilələri qədim Roma və Yunanıstanda da geniş yayılmışdı. Romada ilk nikah müqavilələri tabulae nuptiales adlanırdı, ərlə-arvadın əmlak münasibətlərini tənzimləyən könüllü razılaşma idi. Mahiyyətinə görə ilk nikah müqavilələri nikaha daxil olan tərəflərin ailələri arasında bağlanır və nikah zamanı elan olunur, bundan sonra 10 şahid möhürləri ilə o müqaviləni təsdiq edirdi. Cehiz səhmləri dövlət qeydiyyatına alınırdı. Cehizinin düzgün qeyd olunması ər üçün çox vacib idi: əgər əmlak vaxtında qeydiyyata alınmayıbsa, o, arvadın sağlığında istifadə edirdi və onun ölümündən sonra cehiz arvadın qohumlarına keçirdi.

Eramızın 311-ci ildə papirus üzərində qeydə alınmış prenuptial razılaşmanın nümunəsi də qorunub saxlanılır. *Sənəddə bildirilir ki, Heraklid, Kos adasından olan Leptin və Filotida qızı Demetrius, azad doğulmuş qadınla evlənir. Heraklidlər, öz növbəsində, Demetrianı-sərbəst doğulmuş qadına uyğun olan hər şeylə təmin edəcəkdir. Demetria, ərini utandıracaq bir səhv edərsə, özü ilə birlikdə gətirdiyi hər şeyi itirəcəkdir, bununla birlikdə Heraklidlər Demetriyaya qarşı irəli sürülən ittihamlar 3 kişinin şahidliyi ilə sübut etməlidirlər.*

XVIII əsrin sonu XIX əsrin əvvəllərində Fransa, İngiltərə, Almaniya və Avstriyada nikah müqaviləsi institutu yenidən bərpa olundu. Məhz bu dövrdən etibarən nikah müqaviləsi hüquqi qüvvə qazanır.

Nikah müqaviləsinin məzmununun əsas elementi əmlakın hüquqi rejimin qurulmasıdır. Nikah müqaviləsi ilə müəyyən edilən belə rejim, əmlakın müqavilə rejimi adlanır.

Nikah müqaviləsi mülkiyyətin hüquqi rejiminin qurulmasına və dəyişdirilməsinə yönəlmiş müqavilələri birləşdirən mülki müqavilələrin ayrı bir növü kimi qəbul edilməlidir. Eyni tipə ümumi mülkiyyətin bölünməsi və ümumi mülkiyyətin istifadəsi ilə bağlı müqavilələri də aid etmək olar. Nikah müqaviləsinin vacib xüsusiyyəti onun mürəkkəbliyi ilə bağlıdır. Müqavilə yalnız ər-arvadın əmlakının hüquqi rejimini müəyyən etmək və ya dəyişdirməyə yönəlmiş müddəaları ehtiva etmir, eyni zamanda ər-arvadın bir-birlərinin saxlanması üçün vəsait təmin etməsi məsələlərini də tənzimləyə bilər. Ancaq Ailə Məcəlləsinin qəbul edilməsindən əvvəl, nikah müqaviləsinin bağlanması olduqca çətin idi, çünki Mülki Məcəllədə onun

məzmunu, bağlanma qaydası, xitam qaydası və digər vacib məqamlar mövcud deyildi. Ər-arvad yalnız müqavilələr haqqında mülki qanunvericiliyin ümumi qaydalarını rəhbər tuta bilərdi.

Nikah müqaviləsinin subyekti yalnız ər-arvad ola bilər. Buna görə də müqavilə bağlamaq qabiliyyəti nikahın subyekti olmaqla əlaqələndirilməlidir. Bir şəxs nikah yaşına çatmamışdırsa, nikah qeydiyyata alınana qədər valideynlərinin və ya qəyyumlarının razılığı olmadan nikah müqaviləsi bağlaya bilməz. Evləndikdən sonra tərəflər tam fəaliyyət qabiliyyətli olur və müstəqil olaraq nikah müqaviləsi bağlamaq hüququna malik olurlar. Müstəqil olaraq nikah müqaviləsi bağlamaq hüququ emansipasiya edilmiş şəxslərə də məxsusdur. Çünki Mülki Məcəllənin 28-ci maddəsinə əsasən onlar tam fəaliyyət qabiliyyətli olurlar. "On altı yaşı tamam olmuş yetkinlik yaşına çatmayanlar əmək müqaviləsi üzrə işləyirsə və ya valideynlərinin, övladlığa götürənlərin və ya himayəçinin razılığı ilə sahibkarlıq fəaliyyəti ilə məşğul olursa, tam fəaliyyət qabiliyyətli sayıla bilər. Hər iki valideynin, övladlığa götürənlərin və ya himayəçinin razılığına əsasən qəyyumluq və himayəçilik orqanının qərarı ilə, belə razılıq olmadıqda isə məhkəmənin qərarı ilə yetkinlik yaşına çatmayan tam fəaliyyət qabiliyyətli sayılır (emansipasiya). On səkkiz yaşına çatanadək nikaha girməyə qanunun yol verdiyi halda, on səkkiz yaşına çatmamış fiziki şəxs nikaha girdiyi vaxtdan tam həcmdə fəaliyyət qabiliyyəti əldə edir. Nikah bağlanması nəticəsində əldə edilmiş fəaliyyət qabiliyyəti nikahın on səkkiz yaşına çatanadək pozulduğu halda da tam həcmdə saxlanılır".

Nikahdan əvvəl faktiki ər-arvad münasibətində olan şəxslər arasında müqavilə bağlana bilər. Onların razılığı nikah müqavilə olmayacaq, çünki qanunvericilik həqiqi nikaha hüquqi əhəmiyyət vermir. Ancaq mülki qanunvericilikdə müqavilələrin bitkin bir siyahısını olmadığı üçün, faktiki ər-arvad münasibətində olan şəxslər prinsipcə, mülki münasibətlərini tənzimləməyə yönəlmiş müqavilələr bağlaya bilərlər. Onlar öz razılığı ilə həqiqi nikahda əldə edilmiş əmlaka ümumi ortaq mülkiyyət rejimi qura bilməzlər.

Nikah müqaviləsi yazılı formada bağlanılır və notarial qaydada təsdiqlənir. Bu cür forma tələbləri həm ər (arvad), həm də üçüncü tərəflər üçün nikah müqaviləsinin xüsusi mənası ilə bağlıdır. Bu müqavilə, bir qayda olaraq, çox uzun müddətə etibarlıdır və gələcək üçün mülkiyyət hüquqlarını və öhdəliklərini müəyyənləşdirir.

Nikahın etibarsızlığı nikah müqaviləsinin avtomatik etibarsız olmasına gətirib çıxarır. Nikahın olması, əvvəllər qeyd olunduğu kimi, nikah müqaviləsinin zəruri elementidir, buna görə də nikah etibarsız elan olunarsa, nikah müqaviləsi bağlandığı andan hüquqi qüvvəsini itirir.

Bəzi mülkiyyət növlərinin ümumi əmlakdan xaric edilə bilər, məsələn, pensiya və ya müavinətlər, peşə fəaliyyəti obyektləri, əlavə gəlir, zərgərlik, hobbi üçün istifadə olunan əşyalar ola bilər. Başqa bir ümumi hal, ər-arvadın əmək fəaliyyətindən və onların hesabına əldə edilmiş əmlakdan əldə edilən gəlirin ümumi olduğunu və əlavə gəlir, o cümlədən sahibkarlıq fəaliyyətindən əldə etdiyi ərə (arvada) aid olacağını müəyyənləşdirməkdir.

Nikah müqaviləsində ər-arvad, bir-birinin saxlanması üçün öhdəliklər müəyyən etmək hüququna malikdirlər. Mövcud qanunvericiliyə görə aliment almaq hüququ olan ərin (arvadın) saxlanması haqqında danışırıqsa, bu müddəalar aliment sazişi üçün müəyyən edilmiş bütün məhdudiyyətlərə məruz qalır. Xüsusilə, ehtiyacı olan ərin (arvadın) hüquqları pozulmamalıdır. Bununla yanaşı, aliment almaq hüququ olmayan ərin (arvadın) dəstək olmaq hüququ, nikah müqaviləsində nəzərdə tutula bilər.

Bu hər şeydən əvvəl, ailəyə daha çox vaxt ayırmaq üçün ər-arvadın qarşılıqlı istəyi ilə işdən və ya təhsildən ayrılan tərəfə aiddir. Belə halda ər (arvad) şübhəsiz ki, nikah müqaviləsində həm nikah dövründə, həm də onun boşanmadan sonra dəstək almaq hüququnu açıq şəkildə göstərilməsində maraqlıdır. Qanuni olaraq hüququ olmayan ərin (arvadın) təminat alması, ər-arvadın istədiyi hallarda nikah müqaviləsinə daxil edilə bilər.

Ər-arvad bir müddət evli olduqları və müəyyən bir əmlak əldə etdikləri təqdirdə nikah müqaviləsi bağlanarsa, müqavilənin hüquqi qüvvəsini tərəflər müəyyən edir. Belə ki, bu müqavilə həm nikah bağlandığı anadan, həm də müqavilə hüquqi qüvvəyə mindikdən sonrakı dövrə aid edilə bilər. Bu tərəflərin seçimindən asılı olaraq müəyyən edilir. Nikah müqaviləsinin köməyi ilə ər-arvad, hər birinə məxsus olan əmlakı, o cümlədən nikahdankənar əmlakı yenidən bölüşdürmək hüququna malikdirlər. Məsələn, bu əmlakların hamısının ümumi mülkləri olacağını müəyyən edə bilərlər.

Nikah müqaviləsində nəzərdə tutulan hüquqlar və vəzifələr müəyyən bir müddətlə məhdudlaşdırıla və ya müəyyən şərtlərin baş verməsi və ya baş verməməsindən asılı edilə bilər. Ər (arvad) məsələn, evliliyin ilk illərində əmlaklarının ayrı olacağını və bu müddətdən sonra ortaq olacağını əvvəlcədən müəyyən edə bilərlər.

Nikah müqaviləsinin hüquqilik şərti hər hansısa mülki müqavilənin hüquqilik şərti ilə eynidir. Subyektlər səlahiyyətli olmalıdır, iradə iradəyə uyğun olmalıdır və sərbəst şəkildə formalaşmalıdır, nikah müqaviləsinin məzmunu qanuna zidd olmamalıdır. Nikah müqaviləsi tərəflərin fəaliyyət qabiliyyətini və ya məhkəməyə müraciət etmək hüququnu məhdudlaşdıra bilməz. Nikah müqaviləsində uşaqlarla bağlı məsələlər tənzimlənə

bilməz, çünki ilk növbədə nikah müqaviləsi xüsusi razılıqdır və yalnız ər-arvadla bağlı məsələləri əhatə etməli və üçüncü tərəflər, o cümlədən uşaqlar üçün hüquq və vəzifələr yaratmamalıdır.

Uşaqlarla bağlı məsələlər ayrıca bir hüququn predmeti olduğu üçün hətta valideynlərinin uşaqların böyüdülməsi və ya tərbiyəsi ilə bağlı müqavilələr bağlamaq hüququ olduqda, uşaqların qanuni nümayəndələri kimi çıxış edirlər və ya uşaqlar üçün müəyyən hüquqi nəticələrə səbəb olan müqavilələr bağlayırlar. Buna görə uşaqların hüquqlarına təsir edən bütün hərəkətlər ayrı-ayrılıqda və bəzi hallarda müəyyən yaşa çatmış uşaqların fikirləri nəzərə alınmaqla həyata keçirilməlidir.

Nikah müqaviləsi ər-arvadın şəxsi qeyri-əmlak münasibətlərini tənzimləyə bilməz. Bunun səbəbi, yerinə yetirilmədiyi təqdirdə tətbiq edilə bilən hüquq və vəzifələrin nikah müqaviləsinə daxil edilə bilməməsi ilə əlaqədardır. Yalnız fərdi xarakter daşıyan öhdəliklər icra edilə bilməz. Ər-arvadın zibili kim çıxaracağı və uşağı kimin yatağına qoyacağı ilə bağlı şərtlərini nikah müqaviləsinə daxil etmək imkanı varsa, bu vəzifələrin yerinə yetirilməməsinə görə heç bir sanksiya tətbiq edə bilmədikləri aydındır. Bu cür "vəzifələr"lə bağlı məhkəmə mübahisəsini təsəvvür etmək çətindir.

Ər-arvadın ailə həyatı ilə bağlı digər məsələlərin həlli proseduruna dair müddəalara da yer verməyə hüququ yoxdur, çünki bu şərtlər də güclə həyata keçirilə bilməz. Ər-arvad şəxsi münasibətləri razılaşmalar yolu ilə tənzimləyə bilər, lakin bu müqavilələr qeyri-qanuni olacaqdır.

Nikah müqaviləsinə aliment almaq ehtiyacı olan əlil həyat yoldaşının hüququnu məhdudlaşdıran şərtlər daxil edilə bilməz.

Nikah müqaviləsi ilə bağlı daha bir xüsusi məhdudiyyət var: müqavilə ər-arvaddan birini həddən artıq əlverişsiz vəziyyətə salmamalıdır. Əks təqdirdə, müqavilə mübahisəli hüquqi əqddir və hüquqları pozulmuş ərin (arvadın) tələbi ilə etibarsız sayıla bilər. Tərəflərdən birini həddindən artıq əlverişsiz vəziyyətə salan müqavilələr olaraq, ər-arvaddan birinin nikahda əldə edilmiş əmlaka olan hüququndan tamamilə imtina etməsi, nikahdankənar əmlakını digər həyat yoldaşına verməsi və buna bənzər müqavilələr nəzərdə tutulur. Bu şərt, nikah müqaviləsinə şamil edilsə də, şəxsin özü üçün son dərəcə əlverişsiz şərtlərdə çətin vəziyyətlərin birləşməsinin təsiri altında bağladığı etibarsız mülki əqdin tanınması imkanını təmin edən qayda ilə eyni deyildir. Bu vəziyyətdə çətin vəziyyətlərin mövcudluğunu sübut etmək lazım deyil, ər-arvaddan birini həddindən artıq əlverişsiz vəziyyətə salmaq kifayətdir.

Nikah müqaviləsi ailə hüququnun əsas prinsiplərinə zidd olmamalıdır. Qanunun bu müddəası məhkəmə mülahizəsinə xeyli geniş yer açır. Bu vəziyyətdə ailə qanunvericiliyinin əsas prinsipləri ailənin dövlət tərəfindən qorunması, ailədəki ər-arvad bərabərliyi və əlil ailə üzvlərinin maraqlarının prioritet qorunmasını təmin etməkdir. Bu prinsiplərdən hər hansı biri pozulursa, nikah müqaviləsi, ər-arvad tərəfindən mübahisələndirilə bilər.

Nikah müqaviləsinin dəyişdirilməsi və ya ləğv edilməsi, ər-arvadın qarşılıqlı razılığı ilə istənilən vaxt mümkündür. Belə bir dəyişiklik və ya ləğv barədə razılığa gəlmək yazılı şəkildə edilməli və notarial qaydada təsdiqlənməlidir. Əvvəlcədən əldə edilən razılaşmanın yerinə yetirilməsindən birtərəfli imtina edilməsinə icazə verilmir. Ancaq tərəflər nikah müqaviləsini dəyişdirmək və ya ləğv etmək barədə razılığa gəlməyə bilərlər və eyni zamanda vəziyyət o qədər dəyişə bilər ki, nikah müqaviləsinin icrası ər-arvaddan birinin maraqlarının ciddi şəkildə pozulmasına səbəb olsun. Bu hallarda, müqavilə dəyişdirilə və ya məhkəmə tərəfindən ərin (arvadın) tələbi ilə xitam verilə bilər.

Nikah müqaviləsinin özünəməxsusluğu və xüsusən davamlı xarakter daşımasına görə o, məhkəmə tərəfindən daha tez dəyişdirilə və xitam tələb edə bilər. Nikah müqaviləsinin qüvvədə olduğu müddətdə ər-arvaddan biri işləməyə bilər, işini itirə bilər, ər-arvadın gəlir nisbəti o qədər dəyişə bilər ki, nikah müqaviləsinin müddəaları tərəflərdən biri üçün son dərəcə əlverişsiz olsun. Məsələn, gəlirləri az olan ər-arvad digərini dəstəkləməyə məcbur olacaq. Buna görə Ailə Məcəlləsinin layihəsində, məhkəməyə nikah müqaviləsini sadələşdirilmiş qaydada dəyişdirməyə və ya xitam verməyə imkan verən əlavə müddəaların daxil edilməsi zəruridir. Halbuki, mövcud ailə qanunvericiliyi nikah müqaviləsi üçün heç bir istisna etmir.

Nikah müqaviləsi nikah pozulduqdan sonra əmlakdan istifadə qaydasını da müəyyən edə bilər. Nikahın sona çatması ilə mülkiyyətin müqavilə rejimi dayandırılır. Bu anda əldə edilən bütün əmlak onu əldə etmiş ərə (arvada) aiddir.

Nikah müqaviləsi digər əməliyyatlar kimi, məhkəmədə etibarsız elan edilə bilər. Nikah müqaviləsinin etibarsız sayılması mülki qanunvericiliklə nəzərdə tutulduğu qaydada və eyni əsaslarla mümkündür. Nikah müqaviləsinin məzmunu qanuna ziddirsə, xəyali və ya uydurma bir əməliyyatdırsa, nikah müqaviləsi bağlanarkən ər-arvaddan biri fəaliyyət qabiliyyətsiz idisə, etibarsızdır. Əvvəlcədən əldə edilmiş razılaşmanın məzmunu ailə və ya mülki hüquq normalarını pozursa, qanuna zidd hesab olunur.

Hüquq və əxlaq qaydalarına zidd olan məqsədyönlü nikah müqaviləsi bağlamaq olduqca nadirdir. Nikah müqaviləsi qanuni nəticələrə səbəb olmaq niyyəti olmadan bağlandığı halda, məsələn, müəyyən əmlak

üzərində girov qoyulmasının qarşısını almaq, varislərin hüquqlarını pozmaq və saxta nikahda həqiqi nikah görünüşünü yaratmaq kimi xəyali bir əməliyyatdır.

Nikah müqaviləsi mübahisələndirilə bilər. Nikah müqaviləsinə etiraz etmək üçün ümumi şərtlər nəzərdə tutulmuşdur. Nikah müqaviləsi yetkinlik yaşına çatmamış şəxs tərəfindən qanuni nümayəndələrin razılığı olmadan imzalanmışdırsa, qanuni nümayəndələr etiraz edə biər. Nikah müqaviləsinin zorakılığın, hədə-qorxunun və ya çətin vəziyyətin təsiri altında bağlanmışdırsa, mübahisələndirilə bilər. Gəlin belə bir hipotetik bir hadisəni təsəvvür edək: hamilə olan və ya artıq uşaq dünyaya gətirmiş qadın uşağın atasının onunla evlənməsini təmin etmək üçün nikah zamanı əldə ediləcək bütün əmlakın rədd edilməsi şərtlərini özündə əks etdirən nikah müqaviləsi imzalamağa məcbur olur.

Beləliklə, nikah müqaviləsi sosial-iqtisadi şəraitin nəticəsində meydana gəlmişdir. Nikah müqaviləsinin tətbiqi mübahisələrin məhkəməyə müraciət etmədən həllinə şərait yaradır. Nikah müqaviləsi vasitəsilə ər və arvad əldə etdikləri əmlaklarının hüquqi rejimini müəyyən edirlər.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Konstitusiyası, "Hüquq Yayınevi", Bakı 2019;
2. Azərbaycan Respublikasının Mülki Məcəlləsi, "Hüquq Yayınevi", Bakı 2020;
3. Антокольская М.В. Семейное право. М., Юристь, 2014; 158-171
4. Левушкин Анатолий Николаевич-Брачный договор в российской федерации, других государствах - участниках содружества независимых государств и балтии учебно-практическое пособие; 20-30
5. Левушкин Анатолий Николаевич-История возникновения и развития института брачного договора в России, «Семейное и жилищное право», 2012, N 5; 1-13
6. https://rospravosudie.com/law/ 11. Тарусина Н.Н. Семейное право. Учеб. пособие. - М.: ПРОСПЕКТ, 2001. 27-36

## The concept and content of the the contractual regime of property

## Summary

Historically, the institution of marriage contracts in family law has been associated with the creation of private property. The main element of the content of the marriage contract is the establishment of a legal regime for the property . Such a mode of marriage is called a contract of property. The legality of the marriage contract is the same as the legality of any civil contract. Subjects must be competent, have the will and must be freely formed, and the content of the marriage contract must not be in conflict with the law.

## Понятие и содержание договорного режима собственности

## Резюме

Исторически институт брачных договоров в семейном праве был связан с созданием частной собственности. Основным элементом содержания брачного договора является установление правового режима для имущества. Этот тип брачного договора называется договором собственности. Законность брачного договора такая же, как и у любого гражданского договора. Субъекты должны быть компетентными, иметь волю и должны быть свободно сформированы, а содержание брачного контракта не должно противоречить закону.

**Rəyçi: dos. F.Mirzəyeva**

Göndərilib: 20.03.2020 Qəbul edilib: 25.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/43-46

**Aynur Teymur qızı Bəxtiyarova**
Bakı Dövlət Universiteti
aynur.baxtiyarova96@mail.ru

# BMT-nin TƏSİSATLARI VƏ İNFORMASİYA CƏMİYYƏTİ QURUCULUĞU

***Açar sözlər:** BMT, informasiya cəmiyyəti, UNESCO, qloballaşma*
***Key words:** UN, information society, UNESCO, globalization*
***Ключевые слова:** ООН, информационное общество, ЮНЕСКО, глобализация*

## Giriş

İnformasiya cəmiyyətinin qloballaşması, vahid internet şəbəkəsinin insan fəaliyyətini əhatə etməsi beynəlxalq təşkilatların rolunu daha da artırmışdır. Bununla bağlı BMT və onun təsisatları xüsusi qeyd olunmalıdır. Məqalədə BMT-nin təsisatlarının informasiya cəmiyyəti quruculuğunda fəaliyyəti təhlil edilmiş, təklif və tövsiyələr irəli sürülmüşdür.

BMT qlobal informasiya cəmiyyəti üzrə münasibətlərin tənzimlənməsində öz ixtisaslaşmış qurumları vasitəsilə iştirak edir.Onlardan bir neçəsinə nəzər salsaq.

BMT-nin İnkişaf Proqramı inkişaf etməkdə olan ölkələrdə İKT-nin inkişafı üçün əlverişli şəraitin yaradılması istiqamətində fəaliyyət göstərir.Bu qurum xüsusi fond vasitəsilə İKT-nin inkişafı üzrə yerli, regional və beynəlxalq proqramları maliyyələşdirir; İKT sahəsində fəaliyyət göstərən təşkilatların beynəlxalq-hüquqi müdafiəsi ilə məşğul olur; İKT sahəsində beynəlxalq əlaqələrin genişləndirilməsinə səy göstərir; İKT üzrə proqramların həyata keçirilməsi üçün strategiya və tövsiyələr hazırlayır.

BMT-nin elm, təhsil və mədəniyyət məsələləri üzrə ixtisaslaşdırılmış qurumu olan YUNESKO dünyada təhsil, elm və mədəniyyət məsələləri sahəsindəki əməkdaşlıöın ən böyük hökumətlərarası forumudur.Öz fəaliyyətində fikir və ifadə azadlığına, kommunikasiya və informasiya problemlərinə xüsusi önəm verən YUNESKO informasiya sahəsində formalaşmaqda olan münasibətlərin tənzimlənməsinə dair təklif və tövsiyələr verir. Bilik cəmiyyətləri ideyasını irəli sürən bu qurum bəyan edir ki, həmin cəmiyyətlər dörd əsas prinsipə söykənir:

1. Fikir və ifadə azadlığı;
2. İnformasiya və biliklərin əlyetənliy;
3. Mədəni və linqvistik fərqliliyə hörmət;
4. Hər kəs üçün keyfiyyətli təhsil.

BMT-nin digər ixtisaslaşdırılmış qurumu olan Beynəlxalq Telekommunikasiya İttifaqı (BTİ) informasiya cəmiyyəti infrastrukturunun formalaşdırılması ilə bağlı bir sıra problemlərlə məşğul olur. BTİ-nin müəyyən etdiyi standartlar qlobal telekommunikasiya sisteminin möhkəmləndirilməsində mühüm əhəmiyyətə malikdir. Qurum İKT-yə, eləcə də İnternetə bərabərhüquqlu çıxış imkanını genişzolaqlı internet şəbəkəsinin yaradılması ilə təmin edir. Bu məqsədlə BTİ həm ictimai, həm də özəl sektorla qarşılıqlı əlaqəli fəaliyyət göstərir.

BTİ-nin fəaliyyəti üç sektor üzrə həyata keçirilir:beynəlxalq telekommunikasiyanın standartlaşdırılması sektoru, radiokommunikasiya sektoru və inkişaf sektoru. Ümumilikdə, BTİ-nin dəstəyi ilə aparılan tədqiqatlar informasiya infrastrukturunun inkişafına istiqamətlənmişdir.

İnformasiya cəmiyyətinin formalaşması və inkişafı informasiyanın cəmiyyətin bütün sferalarını əhatə etməsi ilə nəticələnmişdir ki, bu da yeni növ ictimai münasibətlərin hüquqi cəhətdən nizama salınmasını şərtləndirmişdir. Həmin münasibətlər informasiya hüququnun predmentini təşkil etdiyi üçün informasiya cəmiyyətinin səciyyəvi xüsusiyyətlərinin şərhi informasiya hüquq elmi üçün zəruri olan bir çox məsələlərə aydınlıq gətirə bilər.

2003-cü ildə Cenevrədə İnformasiya Cəmiyyəti Məsələləri üzrə Ümumdünya Sammitində qəbul edilmiş Prinsiplər Bəyannaməsinin 1-ci bəndinə müvafiq olaraq, informasiya cəmiyyəti dedikdə elə bir cəmiyyət başa düşülür ki, burada hər kəs informasiya və bilik yarada, onu əldə edə və paylaşa bilər.Bu da ayrı-ayrı xalqlars və millətlərə imkan verir ki, BMT-nin məqsəd və prinsiplərinə əsasən, eləcə də Ümumdünya İnsan Hüquqları Bəyannaməsinə riayət edərək, öz potensialını nümayiş etdirsin və həyat səviyyəsini yüksəltsin.

İnformasiya cəmiyyətində məlumatlandırma, yəni zəruri informasiyanın bütün istifadəçilərə çatdırılması, biliklərin saxlanılması və yayılması, eləcə də informasiya texnikası vasitələri və informasiya resurslarından

öz maraq və mənafeləri daxilində istifadə ilə bağlı təlimatlandırma və cəmiyyətin mütərəqqi inkişafı məqsədilə biliklərdən istifadə olunması funksiyaları reallaşdırılır.

Mənbələrə görə, informasiya cəmiyyətinin qurulması məsələləri ilk olaraq, XX əsrin 60-70-ci illərdə ABŞ-da araşdırılmağa başladı.Ondan sonra Avropa Birliyi də bu sahəyə marağını yönəltdi. 1994-cü ilin əvvəllərində Avropa Birliyi məşhur mütəxəssislərdən ibarət qrup yaradaraq, ona informasiya cəmiyyəti ilə bağlı hesabat hazırlamağı tapşırdı. Qrupun rəhbəri Martin Banqemanın adı ilə adlandırılan “Banqeman hesabatı” 1994-cü ildə müzakirəyə çıxarıldı. Bununla da Avropada informasiya cəmiyyətinin qlobal səviyyədə inkişafına təkan verildi.

Artıq 1980-ci illərdə bir çox inkişaf etmiş dövlətlərdə informasiya biznesi və informasiya xidmətləri sürətlə inkişaf etməyə başladı.Məsələn, həmin dövrdə ABŞ-da əhalinin 3%-i kənd təsərrüfatında, 20%-i sənayedə, 30%-i xidmət sahələrində çalışırdısa, 49%-i informasiya ilə işləmə vasitələrinin yaradılması ilə məşğul olurdular.

Zamanın tələbinə uyğun olaraq, informasiya və texnologiya əsrində cəmiyyət də informasiyalaşdırıldı və bununla da informasiya cəmiyyəti yarandı. İnformasiya cəmiyyətinin əsas məqsədi bütövlükdə cəmiyyətin və ayrı-ayrı şəxslərin informasiya tələbatını ödəmək üçün müasir informasiya texnologiyaları bazasında müxtəlif təyinatı informasiya resurs və fəzaların formalaşdırılmasıdır.

İnformasiya cəmiyyətinin yaranışı Amerika iqtisadçısı Frits Maxlup və yapon sosioloqu Umesao Tadaonun adları ilə bağlıdır.İnformasiya cəmiyyəti anlayışı ilə yanaşı, həmçinin “texnotron cəmiyyət”, “biliklər cəmiyyəti”, “postindustrial cəmiyyət”, “açıq cəmiyyət” kimi anlayışlardan da istifadə olunmuş və olunmaqdadır.

İnformasiya cəmiyyətinin səciyyəvi xüsusiyyətləri vardır. Bu xüsusiyyətlər müasir dövrün tədqiqatçıları tərəfindən müxtəlif aspektlərdən izah olunur. Məsələn, bəzi müəlliflər informasiya cəmiyyətinin aşağıdakı əsas əlamətlərini sadalayırlar:

1. Ənənəvi bazarlarla yanaşı, informasiya və texnologiya bazarlarının formalaşdırılması və informasiya ehtiyatlarının dövlətin real ehtiyatlarına çevrilməsi.
2. İqtisadiyyatın maksimal səviyyədə qeyri-istehsal sektoruna istiqamətləndirilməsi.
3. Daha etibarlı və nisbətən münasib qiyməti olan fərdi kompüterlərin geniş yayılması, istənilən həcmdə məlumatların ötürülməsinə imkan verən şəbəkənin mövcudluğu.
4. İctimai və fərdi istifadə üçün əlyetər olan informasiya resursları və xidmətlərinin təkrar artımı.
5. Cəmiyyətdə yüksək səviyyədə hüquq mədəniyyətinin olması və hüquqi dövlətin fəaliyyət göstərməsi.
6. Sosial-iqtisadi və dövlət institutlarının fəaliyyətini informasiya infrastrukturlarından asılılıq səviyyəsinin artması.
7. Dünya üzrə vahid-qlobal informasiya məkanının yaradılması.
8. Dövlətlərin vahid informasiya fəzasının formalaşdırılması.
9. İnformasiya təhlükəsizliyinin təminatına dair tələblərin artırılması və bu sahədə hüquqi bazanın yaradılması.

İnformasiya cəmiyyətinə dair şərhlərin ümumiləşdirilməsi, həmçinin Cenevrə Prinsiplər Bəyannaməsinin təhlili nəticəsində aşağıdakı əlamətləri müəyyən etmək olar [1, s. 54-56]

1. Biliklərə pərəstiş (biliklər kultu) – informasiya cəmiyyətində biliklərdən istifadəni nəzərdə tutur. İnformasiya cəmiyyəti üçün relevant informasiyadan istifadə xarakterikdir.
2. İnformasiya infrastrukturu – cəmiyyətin fəaliyyətinin informasiya sferasının dəstəklənməsi və normal təminatı üçün yaradılmış texniki-proqram vasitələrini əhatə edir, həmçinin istifadəçilərin informasiya resurslarına asan çıxışının təmin edilməsi məqsədini daşıyır.
3. İnformasiya iqtisadiyyatı – informasiya və biliklərin istehsalı,emalı,saxlanması və yayılması üzrə fəaliyyət nəticəsində daxili məhsulların axınını təmin edən iqtisadiyyatı əhatə edir.
4. İnformasiya əmək bazarı – o deməkdir ki, cəmiyyətin əmək ehtiyatlarının 50%-dən çoxu informasiya sahəsində çalışır və məhz bundan asılı olaraq:
5. İnformasiya cəmiyyətində istehsal olunacaq məhsul kimi bilik və intellekt çıxış edir. İntellektual əməklə bağlı sənət sahələrini seçənlərin sayı günbəgün artır;
6. Dəyərlər dəyişir və yeni həyat tərzi formalaşır, asudə vaxtda məşğuliyyətlətin seçimi və dairəsi dəyişir;
7. Məhsul istehsalında və cəmiyyətin başqa sahələrində “insansız” maşınlara daha geniş yer verilir, insan isə əsas etibarilə informasiyanın emalı ilə məşğul olur.
8. İnformasiya mədəniyyəti – cəmiyyətin ümumi mədəniyyətinin bir hissəsi olub, informasiya ilə məqsədyönlü işləmək və onun qəbul edilməsi, emalı və ötürülməsi üçün kompüter texnikasından, müasir texniki üsul və vasitələrdən istifadə etmək bacarığıdır.

9. Sosial sahələrin informasiyalaşdırılması – təhsil, seçki kampaniyaları, sənəd dövriyyəsi, kommersiya və digər sosial institutların müasir informasiya texnologiyalarından istifadə etməklə, avtomatlaşdırılmasını nəzərdə tutur.

10. İnformasiya qanunvericiliyi – informasiya cəmiyyətinin formalaşdırılması və inkişafını təmin edən və tənzimləyən qanunvericilik aktlarından ibarətdir.Bu hər bir dövlətin milli qanunvericilik normalarında əks olunur.

Qeyd etmək lazımdır ki, yuxarıda sadalanan əlamət və xüsusiyyətlərin birini digərindən təcrid etmək mümkün deyil, çünki onların hamısı vəhdət şəklində informasiyanı xarakterizə edir. Bu o deməkdir ki, bu əlamətlərdən hər hansı birinin olmaması infornasiya cəmiyyətinin inkişafını ləngidə bilər. Məsələn, İKT-nin yüksək səviyyədə inkişaf etdiyi bir şəraitdə informasiya cəmiyyətinin formalaşmasına güclü zəmin yaransa da, əgər bütün bunlar qanunvericilik qaydasında tənzimlənməzsə, sonda informasiya cəmiyyətində xaos yaranar və bu, müxtəlif özbaşınalıq və cinayət əməllərinin inkişafına gətirib çıxarar.

İnformasiya cəmiyyətinin müsbət xarakterik xüsusiyyətləri ilə yanaşı, təhlükəli meylləri də vardır. Bu çatışmazlıqları informasiya hüququnun problemləri sırasında şərh edən müəlliflər hesab edirlər ki, yeni sosial sistemin formalaşması nə qədər müsbət tərəfləri ilə xarakterizə olunsa da, həm insan, həm də cəmiyyət üçün yeni problemlər yaratmışdır. Bu problemlərə aşağıdakılar daxildir:

- İnformasiya qarşıdurması, böhranı cəmiyyətdə baş verən ziddiyyətlərin, təzadların həllində yeni forma kimi çıxış edir. Bu problemin mahiyyəti ondan ibarətdir ki, bir tərəfdən İKT-nin istehsalı və yayılması üzrə inhisarçılığın geniş vüsət alması qaçılmaz haldır, digər tərəfdən isə müsair informasiya sistemləri beynəlxalq münasibətlərdə yeni “güc tətbiqetmə” vasitələrinə çevrilmişdir.
- İnformasiya təhlükəsizliyi və kibercinayətkarlıq. Yeni texnologiyaların inkişafı yeni cinayətlərin meydana çıxmasını şərtləndirmişdir ki, bunlar ənənəvi cinayətlərlə müqayisədə daha çox ziyan vermək xüsusiyyətinə malikdir.Məsələn, viruslar vasitəsilə eyni zamanda, milyonlarla kompüter sistemini sıradan çıxarmaq mümkün olur.
- İnformasiya mühitində insanın şəxsi həyatının müdafiəsi. İKT-nin inkişafı və fərdi məlumatların şəbəkədə yerləşdirilməsi həmin məlumatların müxtəlif vasitələrlə əldə olunması ilə nəticələnə bilər. Bu baxımdan fərdi məlumatların qorunması ilə bağlı texniki, təşkilati, hüquqi tədbirlərin görülməsi informasiya hüququnun ən vacib problemlərindən biri olmalıdır.
- Müəlliflik hüquqlarının qorunması. İnformasiyanın hər kəs üçün açıq və əlyetər olması əksər hallarda müəlliflik hüquqlarının pozulması ilə nəticələnir. İlkin mənbəyə istinad tələbi demək olar ki, bütün dövlətlərin qanunvericilik aktlarında nəzərdə tutulsa da, plagiat hallarının sayı günbəgün artmaqdadır. Belə halların aradan qaldırılması informasiya hüququnun problemlərindən biridir.
- “Bioloji inqilab”ın baş vermə təhlükəsi. İKT-nin inkişafı nəticəsində insanın genetik məlumatlarının əldə olunması və müxtəlif eyniləşdirmə məqsədləri üçün istifadəsi təbiətdə ekoloji balansın pozulmasına gətirib çıxara bilər.Bu da hər şeydən əvvəl insanın özü üçün təhlükəli olan “Bioloji inqilab”la nəticələnəcəkdir [4, s. 21-25].

## Nəticə

İKT-nin inkişafı və internetin vahid şəbəkə kimi formalaşması informasiya cəmiyyəti quruculuğunun yalnız dövlətdaxili hüquqla tənzimlənməməsinə, eyni zamanda beynəlxalq-hüquqi nizamasalmaya xüsusi diqqət ayrılmasına gətirib çıxarmışdır. Digər tərəfdən, ənənəvi cəmiyyətdə mövcud bərabərsizliklərin qarşısının alınması sferasında inkişaf etməkdə olan və zəif inkişaf etmiş dövlətlər təkbaşına o qədər də gücə malik deyillər. Bu baaxımdan, BMT-nin təsisatlarının fəaliyyəti mühüm əhəmiyyətə malikdir. Həmçinin yeni inkişaf edən rəqəmsal cəmiyyətdə bir çox münasibətlər meydana çıxır ki, onların tənzimlənməsi üçün hüquqi bazaya ehtiyac vardır. Bu istiqamətdə BMT təsisatlarının qəbul etdiyi beynəlxalq sənədlər xüsusi istiqamətləndirici xarakterə malikdir. Həmin beynəlxalq-hüquqi normaların milli hüquqa implementasiyası istiqamətinddə tədbirlərin davam etidirilməsi qlobal informasiya cəmiyyətinin məqsədlərinə xidmət edir.

## Ədəbiyyat

1. Əliyev Ə.İ., Rzayeva G.A., İbrahimova A.N., Məhərrəmov B.A., Məmmədrzalı Ş.S. İnformasiya hüququ: Dərslik. Bakı: Nurlar, 2019, 448 s.
2. Human Rights in the Global Information Society (Information Revolution and Global Politics). Edited by Rikke Frank Jorgensen, London: The MIT Press Cambridge, Massachusets, 2006, 323 p.
3. Абдуллаев И.З. Информационное общество и глобализация: Критика неолиберальной концепции. Ташкент: Фан ва технология, 2006, 191 с.

4. Кузнецов П.У. Основы информационного права: Учебник для бакалавров. Москва: Проспект, 2016, с. 21-25.
5. Обществознание: Глобальный мир в XXI веке. Книга для учителя. Под редакцией *Л.В.Полякова, М.: Просвещение, 2007, 367 с.*

**Un institutions and information society building**
**Summary**

The globalization of the information society and the integration of a single internet network into human activities have further enhanced the role of international organizations. In this regard, the UN and its institutions should be specifically mentioned. The article analyzes the activities of the UN institutions in the information society building and offers suggestions and recommendations.

**Институты ООН и формирование информационного общества**
**Резюме**

Глобализация информационного общества и интеграция единой сети интернет в человеческую деятельность еще более усилили роль международных организаций. В связи с этим следует особо упомянуть ООН и ее институты. В статье анализируется деятельность органов ООН по построению информационного общества и предлагаются предложения и рекомендации.

**Rəyçi: h.f.d G. Rzayeva**

Göndərilib: 14.03.2020 Qəbul edilib: 18.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/47-50

**Aytan Shamshir Aliyeva**
Baku State University
eayten888@gmail.com

# PROTECTION OF FOREIGN INVESTMENT IN THE EUROPEAN: EU INVESTMENT LAW SOURCES

***Key words:*** *European Union, acquis communautaire, foreign direct investment, TFEU, TEU, court decisions*
***Açar sözlər:*** *Avropa İttifaqı, acquis communautaire, xarici birbaşa investisiya, AİFM, AİM, məhkəmə qərarları*
***Ключевые слова:*** *Европейский Союз, acquis communautaire, прямые иностранные инвестиции, инвестиционное право, TFEU,TEU, судебные решения.*

## Introduction

The regulation of foreign investment is one of the most relevant and controversial topics in European Union law and international investment law. The EU Foreign Investment Law is becoming a critical issue, especially after the introduction of the EU competence in foreign direct investment after the Lisbon Treaty and the recent successful problem of the compatibility of bilateral investment treaties of the Member States with EU law. Within this framework, the purpose of the article is to determine whether and to what extent the EU has become an international player in foreign investment. Studying the existing regulatory framework regarding the scope and use of the EU competence and its legal consequences. She examines the foundations on which the EU investment policy is based and which will be based in the future. Recent years have witnessed a growing backlash against foreign direct investment (FDI) across several of the world's biggest economies. The United States, Canada, Australia, and the European Union have all amended existing laws or proposed new legislation for screening FDI in key industries. (1)

A series of blocked or abandoned deals demonstrate that recipient countries have stepped up their enforcement and changed the international deal landscape in fundamental ways. Countries that historically have made little effort to distinguish between domestic and international investors have strengthened their defenses against foreign parties. Meanwhile, countries that already subject investments to review have revamped their laws and broadened the scope of review to capture transactions structured to circumvent the review process. Legislative proposals have emphasized the need to protect emerging technologies like artificial intelligence, wireless communications, and military technology. (8)

The claims relating to norms of an international law of foreign investment can be accepted as principles of international law only if they are based on an accepted source of public international law. These sources of international law are stated in Article 38 (2) of the Statute of the International Court of Justice. It will be useful to indicate the sources available to build up the principles of an international law on foreign investment.

**Treaties**

There have been several regional treaties on foreign investment. The strongest provisions are those contained in Chapter 11 of the North American Free Trade Agreement (NAFTA). The provisions of this chapter largely track the model bilateral investment treaty of the United States. It creates a framework for the free movement of investments within the NAFTA region (the United States, Canada and Mexico). The treaty provides for a strong investor–state dispute resolution mechanism, giving the investor a unilateral right to invoke arbitration against the state.

The ASEAN Treaty on the Protection and Promotion of Foreign Investment contains strong provisions, but, since only approved investments are protected by the treaty, there is sufficient room provided for regulatory control over the entry of foreign investment.

Other regional treaties, such as the Mercosur Agreement, create similar regional arrangements with protection granted in varying degrees to the foreign investment of the participating regional states. The most spectacular of them, if it comes about, is the Free Trade Agreement of the Americas which would cover the whole of North and South America. (9)

**TEU and TFEU as sources of European investment law.**

The EU is the world's main provider and the top global destination of foreign investment. Foreign direct investment stocks held in the rest of the world by investors resident in the EU amounted to €7,412 billion at

ologiyasının sürətlə çökməsindən sonra, Azərbaycan xalqının yenidən öz milli mənəvi dəyərlərinə qayıdışı təbii bir prosesə çevrildi və burada İslam xüsusi bir yer tutdu. Ona görə Azərbaycanın rəhbəri ölkənin islamla münasibətini düzgün və sağlam müstəvidə həll etməyə girişdi. Bununla bağlı bir neçə məqamı ümumiləşdirmək olar:

1. İslam Azərbaycan xalqının dini etiqadı olmaqla milli mədəniyyətinin tərkib hissəsidir.
2. Din cəmiyyətin milli, əxlaqi və mənəvi bütövlüyünün önəmli amili kimi çıxış edir.
3. Müasir dövrdə dövlət-din münasibətlərinin düzgün tənzimlənməsinə ehtiyac duyulur.
4. Dinlər və xalqlar arasında anlaşma və dialoq yeni beynəlxalq şəraitin əsas tələblərindən biridir.

Ümumiyyətlə, islam Azərbaycan xalqının çox önəmli, zəngin milli-mənəvi atributu sayılırdı. Ölkənin beynəlxalq aləmdə gerçək siyasi, iqtisadi müstəqilliyini qoruması, öz milli simasını, varlığını saxlaması üçün həmin zəngin xəzinəyə müraciət etməsi lazım gəlirdi. Heydər Əliyev bütün işlərdə olduğu kimi, burada da, həm məsələnin nəzəri cəhətlərini bilən, onu düzgün həyatı məcraya istiqamətləndirən rəhbər, həm də onun icra mexanizmini tənzimləyən praktik bir dövlət xadimi kimi fəaliyyət göstərdi. Prezident dəfələrlə din xadimləri və ruhanilərlə görüşdü, məscid və ziyarətgahlara baş çəkdi, bütün dini mərasim və bayramlar da xalqa müraciət etdi, bir sıra mərasimlərdə özü iştirak etməklə camaatla və möminlərlə ünsiyyətdə oldu. O, dini məsələlərə özünəxas bir maraqla, həssaslıqla yanaşırdı, hadisələrin seyricisi yox, fəal iştirakçı olaraq onun əsas istiqamətlərini müəyyənləşdirirdi. O, dinin, daha doğrusu, İslamın müasir Azərbaycan cəmiyyətində tutduğu yeri açıb göstərmək, məqsəd və məramını lüzumsuz yad ideoloji cərəyanların, qeyri-ənənəvi dini firqələrin missioner təşkilatların pozucu fəaliyyəti və təxribatlarının qarşısını almaq üçün ölkədə dini işləri tənzimləmək, dövlət-din münasibətlərini sağlam bir müstəvidə qurmaq üçün addımlar atırdı. İslam mənəvi cəhətdən sağlam insanların və sağlam cəmiyyətin qaynağıdır. Sağlam cəmiyyət isə güclü və sarsılmaz dövlətçiliyin əsas sütunudur. Sağlam cəmiyyəti və güclü dövləti olan xalq bütün problemləri həll etməyə, öz işıqlı gələcəyini qurmağa, müasir dünyanın inkişaf və tərəqqi karvanına qoşulmağa qadirdir. Dinə münasibətin aydın təzahürü, dini dəyərlərin əhəmiyyətinin dəyərindən anlaşılması dövrə, zamana həmin konseptual siyasi baxışın çox mühüm tərkib hissəsi kimi diqqəti çəkir. Bu bağlılıq, bu vəhdət-bütövlükdə konsepsiyanın dəyərliliyini və uğurunu təmin edəcək dərəcə önəmlidir.

Müstəqilliyə qovuşandan sonra Azərbaycanda da dinə kütləvi qayıdış müşahidə edilir, hər cür yasaqlar, məhdudiyyətlər aradan qalxır, çoxlu məscidlər tikilir, dini mərasimlər geniş qeyd edilir, dini təhsilə meyl sürətlə artır. Bütün bunlar çox yaxşıdır, lakin həmin proses müəyyən çətinliklər, problemlər də doğururdu. İnam ruhi ehtiyacdan doğmalıdır. Buna görə də, dinə qayıdış dərin, əsaslı olduğu kimi həm də səmimi olmalı, düzgün təməl üzərində qurulmalıdır. Əsas məqsəd budur və Ümummilli lider Heydər Əliyevin dinlə bağlı qayğı və düşüncələrinin də elə məzmununu bu amil müəyyənləşdirirdi. Müstəqil Azərbaycana rəhbərlik etdiyi dövrdə Heydər Əliyevin ölkədəki prosesləri həmişə həssaslıqla izlədiyini, ən müxtəlif dini məsələlərin həllinə diqqətlə yanaşdığını görürük. Təsadüfi deyil ki, onun istər əməli fəaliyyətində, istərsədə elmi nəzəri irsində dinlə bağlı tədbirlər, mülahizələr mühüm yer tutur. Ölkə başçısı mütəfəkkir siyasətçi kimi həm tarixi, həm də müasir aspektdə dindən ardıcıl sürətdə söhbət açmışdır. Onun dinlə bağlı həyata keçirdiyi mühüm əməli işlər və söylədiyi dərin fikirlər bir-biri ilə daxilən bağlanır. Sözü ilə işi bir-birini tamamlayan böyük dövlət xadiminin fəaliyyətinin, düşüncələrinin mühüm bir sahəsini dolğun şəkildə göz önündə canlandırır.

Dindarlarla mütəmadi görüşlərdən tutmuş elmi müşavirələrəcən ən müxtəlif tədbirlərdəki söhbətlərində, çıxışlarında ulu öndər Heydər Əliyev dönə-dönə ən yaxın tarixi dövrün neqativ təcrübəsinə müraciət edir, sovet dövlətinin dinə münasibətinin acı həqiqətlərini yada salırdı. Bunda məqsəd həmin yanlış siyasətin mahiyyətini açıb göstərmək, onun ibrətamizliyi üzərində bizi düşündürməkdir.

Məlumdur ki, sovet ideologiyasında ateizm təbliğatı xüsusi yer tutur, elmi texniki tərəqqinin yaratdığı geniş imkalardan bəhrələnərək təkidlə Allaha etiqadsızlıq təlqin edilirdi. Lakin nə 70 il hökümranlıq edən ideologiya, nə də ateist dünyagörüşü Sovet dövlətini dağıtmaqdan xilas edə bildi. Bunun səbəbləri haqqında dünyanın bir çox siyasətçiləri və mütəxəsisləri müxtəlif fikirlər söyləmişlər. Dərinləşən iqtisadi böhran və bunu müşayiət edən siyasi hərc-mərclik həmin süqutun əsas amilləri kimi irəli sürülmüşdür. Maraqlıdır ki, Heydər Əliyevin şərhlərində həmin amillərlə yanaşı, ideoloji sahələr də vurğulanır. Belə nəticəyə gəlmək ola ki, zahirən çox qüvvətli, möhtəşəm görünən sovet ideologiyası, əslində, saxta, çürük təmələ söykənirdi. Buna görə həmin ideologiyanında, onun insanlara haqq yolundan uzaqlaşdıran təbliğatının məğlubiyyəti qaçılmaz idi və dünyanın altı da bir hissəsinə hökmranlıq edən dövlətin bir göz qırpımındaca çöküşünü Allahın cəzası kimi anlamaq mümkündür.

Ulu öndər Heydər Əliyev hələ ölkə prezidenti seçilməzdən əvvəl 5 sentyabr 1993-cü ildə "Təzəpir" məscidində Peyğəmbər Əleyhissəlamın mövludu münasibəti ilə keçirilən mərasimdəki çıxışında Azərbaycan xalqının bir müddət öz dinindən uzaq düşməsi səbəbləri, bunun acınacaqlı nətcələri üzrərində dayanır və məsələyə, həm də qeyd etdiyimiz aspektdən yanaşırdı. Əlbətdə, Azərbaycan xalqının da keçmiş SSRİ-nin

tərkibində yaşayan digər müsəlman xalqlarınında öz dinindən təcrid olunmasının birbaşa səbəbkarı sovet siyasi-ideoloji sistemi idi və bu mülahizə Heydər Əliyevin təhlilində həmişə ön plana çəkilirdi. Lakin həmin hadisəni, ehtimal şəklində olsa da, eyni zamanda, Allahın sınağı kimi mənalandırmaqla daha geniş dini-fəlsəfi düşüncələr müstəvisinə çıxardaraq deyirdi: "Azərbaycan xalqı uzun müddət öz dinindən məhrum olmuşdur. Bu, əlbətdə, bizim üçün acınacaqlı bir haldır. Ancaq bu nə sizdən, nə də məndən asılı idi. Ola bilər ki, bu Allahın işidir. Və bu da bir imtahandır ki, görsünlər insan öz dinindən məhrum olandan sonra nə bəlalara düşür və öz dininə qayıdandan sonra nə qədər xoşbəxtlik əldə edir" [Azərnəşr 1995, s. 500].

Məsələnin bu şəkildə qoyuluşu dini baxımdan da əsaslı görünür. Məlumdur ki, Qurani-Kərim Allahın öz bəndələrini müxtəlif vasitələlə imtahana çəkdiyini dəfələrlə bizə bildirir. Məsələn, "əl-Bəqərə surəsi 155-157-ci ayələrdə müsibətlə üzləşən Allah bəndələri səbrə dəvət edilir, belə olduqda onların Rəbbi tərəfindən bağışlanması və rəhmət gözləməsidir. Düşünmək olar ki, Azərbaycan müsəlmanları da keçmiş SSRİ-nin tərkibində (digər müsəlmanlar kimi) belə bir sınağa məruz qalmış, lakin Allahın rəğbəti yenidən onları öz dininə qayıtmasına fürsət vermişdir. Müxtəlif səbəblər üzündən öz dinindən uzaq düşənlər, adətən, böyük müsibət və məhrumiyyətlərlə üzləşir, lakin yenidən haqq yolunu tapıb Allaha doğru qayıdarkən onlar həqiqi xoşbəxtlik anlarını yaşayırlar.

Bunu Azərbaycanın timsalında da aydın görmək mümkündür. Müstəqillik dövründə yenidən öz dininə qovuşmaq imkanı əldə etməsi Azərbaycan müsəlmanlarında ruh yüksəkliyi, sevinc hissi doğurur. Buna görə də sovet ideologiyasının anti din, xüsusilə anti islam təbliğatından danışarkən ulu öndər Heydər Əliyev, mahiyyətinə dərindən bələd olduğu bu tarixçənin adətən dini-mənəvi dəyərlərə qayıdışın zəruriliyini və əhəmiyyətini vurğulamaqla tamamlayır. Müdrik və uzaqgörən siyasətçi kimi həmin prosesin indiki tarixi dönəmdə Azərbaycan cəmiyyətinin sağlam əsaslarla yenidən təşəkkülü və inkişafı, milli-mənəvi bütövlüyü və ondan özünəgüvənc psixologiyasının bərpası üçün önəmini müəyyənləşdirir.

Azərbaycan rəhbəri məruzə və çıxışlarında öz xalqının doğma dinindən zorla uzaq salınarkən keçirdiyi iztirabları daima yada salır. Bunda məqsəd, heç də, insanların təsirləndirmək və sarsıtmaq deyildi. Hərçənd ibrətamiz nəticələr üçün emisional-psixoloji yaşantıların da əhəmiyyəti az deyil. Ancaq məqsəd daha böyükdür: yaxın keçmişi acı həqiqətlərini xatırlanması, bunların bir daha təkrar olunmamasının mümkünsüzlüyünü açıqlamaq və şüurlara təlqin etmək naminə idi. Yəqin buna görə də 1998-ci ilin oktyabrnda Bakıda keçirilən "Müasirlik və dini-mənəvi dəyərər" adlı Beynəlxalq konfransındakı geniş çıxışında Heydər Əliyev sovet hakimiyyəti dövründə dinə qarşı aparılmış total və fasiləsiz mübarizənin üzərində ətraflı dayanmağı lazım bilir. Həmin mübarizənin təkcə bir ölkəyə qarşı yox, nəticə etibarilə bütünlükdə bəşəriyyətə qarşı yönəldiyini bəyan edir: "Məlumdur ki, biz 70 il komminist ideologiyası ilə tərbiyələnərək dinimizdən və dinin bizə bəxş etdiyi mənəvi dəyərlərdən məhrum olmuşuq. Kommunist ideologiyasının bəşəriyyətə vurduğu zərbələrdən ən böyüyü 70 il ərzində dinə qarşı aparılmış təbliğat, xüsusən dinin qadağan olunması və təhrif edilməsi olmuşdur" [Əliyev 1997 (2), s. 58]. Sovet hakimiyyətinin dinlə amansız və aramsız mücadiləsi, heç şübhəsiz, sosializmin ictimai-ideoloji mahiyyətindən doğurdu. Lakin həmin təcrübə belə düşünməyə əsas verir ki, sovet ideologiyası dini nüfuzdan salmaqla öz rəhbərlərini bütləşdirmək üçün yol açmağa çalışırdı. Yəqin, elə buna görə də, sovet hakimiyyəti bu yolda ona mane olacaq ən başlıca qüvvəyə-ilahi dinlərə, xüsusilə, İslama qarşı amansız olmuşdur. Çünki, İslam dini, Qurani-Kərim yalnız bir Qadir Allaha tapınmağı önə çəkməklə, hər cür bütpərəstlik meyllərini rədd etmişdir. İslamda insan Allahın bəndəsi olaraq təkcə ona ibadət edir və ondan yardım diləyir [Qurani Kərim 1997, s. 2].

Sovet ideologiyası bir tərəfdən dini qadağan edirsə, başqa bir tərəfdən onu bütün vasitələrlə təhrif etməklə ictimaiyyətin gözündən salmağa çalışırdı. Heydər Əliyev bu məsələni də nəzərdən qaçırmır, sovet ateist təbliğatının acizliyini həm də bu amillə izah edirdi. O, beynəlxalq konfransda sözünə davam edərək bütün səylərinə baxmayaraq, sovet sisteminin dini hisslər, islam həqiqətlərinin ucalığı qarşısında duruş gətirə bilmədiyini qeyd edir, həmin sistemin sürətlə çökməsini buna canlı misal çəkir: "Ancaq, eyni zamanda, bu tarix onu da göstərir ki, din və o cümlədən bizim mənsub olduğumuz islam dini o qədər qüdrətə malikdir ki, heç bir ideologiya, heç bir hakimiyyət və heç bir hökmdar onunla bacara bilməz və 70 illik tarix də göstərir ki, bunu bacara bilməzdi" [Əliyev 1997 (2), s. 59]. Qurani-Kərim haqq olan İslama bütün kafirlərin, müşriklərin və münafiqlərin həmişə çalışdıqlarını, lakin onların uğursuzluğa düçar olacaqlarını ilahi xəbərdarlıqla bütün bədxahlara bildirir. Allahın dininə qarşı olanlar bu nuru söndürməyə çalışsalar da bacarmazlar. "Ət-tövbə" surəsinin 32-ci ayəsində deyilir: "Onlar Allahın nurunu (dəlillərini, islam dinini, Quranı) batil sözləri ilə söndürmək istəyirlər. Allah isə kafirlərin xoşuna gəlməsə də, ancaq öz nurunu (dinini) tamamlamaq istər" [Qurani Kərim 1997, s. 193].

Azərbaycan liderin 9-11 dekabr 1998-ci ildə Bakıda keçirilən başqa bir toplantıda, "İslam sivilizasiyası Qafqazda" adlı Beynəlxalq konfransdakı çıxışında öz konkret müşahidələri və qənaətləri əsasında sovet siyasi-ideoloji sisteminin dinə qarşı yönəlmiş siyasətinin görünən və görünməyən tərəflərindən söhbət açır,

bir daha həmin mübarizənin məğlubiyyətlə nəticələnməsinin qanunauyğunluğuna diqqəti cəlb edir, bu məğlubiyyəti dini hisslərin xalqın həyatına, mənəviyyatına atdığı rişələrin güclü və dərin olması ilə izah edir: "Sovetlər İttifaqının mövcud olduğu 70 il ərzində onun ərazisində din yasaq, qadağan edilmiş, ateizm təbliğatı aparılmışdır. Dinə qarşı çox kəskin mübarizə aparılmış, allahsızlıq, dini inkar etmək o illərdə kommunist ideologiyasının əsasını təşkil etmişdir. Biz bu dövrü yaşamışıq və indi, Azərbaycan öz müstəqilliyini bərpa edəndən sonra tarixi nöqteyi-nəzərdən qısa bir zamanda dinin, o cümlədən İslam dininin nə qədər dərin kökləri olduğunu daha da çox dərk etmiş oluruq"

Ulu öndər Heydər Əliyev yaxın keçmişin tarixi təcrübəsinin obyektiv mənzərəsini rəsm edir, buna görə də onun təhlil və qiymətləri sərrast və inandırıcı səslənir. Ümumiyyətlə, bu mühakimələr fakta əsaslanması və məntiqi ardıcıllığı ilə seçilir. Daha sonra Heydər Əliyev deyir: "Qısa bir zamanda məlum oldu ki, əgər Azərbaycanda kommunist ideologi yaşı 70 il yox, 170 il də hökm sürmüş olsaydı, insanları İslam dinindən ayırmaq mümkün olmayacaqdı. Bu artıq faktdır. Eyni zamanda, bu, İslam dininin nə qədər böyük gücə malik olduğunu sübut edir"[Əliyev, 2005, səh 5].

Ümummilli lider Heydər Əliyev Naxçıvanda tikilən məscidin açılışında söylədiyi geniş nitqində bu incə məsələyə toxunaraq bildirirdi ki, o, Sovetlər İttifaqında yüksək vəzifə tutmuşdu və bu sayaq vəzifəli şəxslər dindən uzaq olmalı idilər. Kommunist Partiyasında və siyasi hakimiyyətdə yüksək yer tutmasına baxmayaraq, Allah daim onun qəlbində olmuş, amma şəraitə görə bunu biruzə verə bilməmişdir. Bütün bunlar şəxsiyyətin daxilində iztirablar doğururdu. Azərbaycan rəhbəri tarixi həqiqəti etiraf etməklə, həm də həmin mənəvi-psixoloji yaşantıları hiss etdirirdi. Bu yolla İslama qarşı aparılan qərəzli təbliğatın cəmiyyətə vurduğu mənəvi ziyana diqqəti yönəldirdi. "İslam sivilizasiyası Qafqazda" adlı Beynəlxalq konfransda söylədiyi fikrilər olduqca maraqlıdır: "Sovet hakimiyyəti dövründə dünyaya gəlmiş, yaşamış nəsillər, bəlkə də, o vaxtkı güclü təbliğat nəticəsində dinin, bizim üçün isə, ələlxüsus, islam dininin bu qədər zəngin mənəvi dəyərlərə, bu qədər dərin köklərə malik olduğunu anlaya bilmirdilər. Biz özümüz də bunu anlaya bilmirdik. Mən bunu etiraf edirəm" [Əliyev, 2001, səh 8].

Azərbaycan rəhbərinin dedikləri bir neçə mühüm məsələni dövrün tarixi həqiqətləri səviyyəsində açıqlayır və ümumiləşdirir: birincisi, sovet ideoloji siyasi sistemi müsəlmanları öz dinindən, dinin zəngin mənəvi dəyərlərindən, islam maarifindən uzaq saxlayırdı, çünki bu dəyərlərin gücünü bildiyinə görə yəqin edirdi ki, cəmiyyətdə sovet ideologiyasının təsiri azalır, İslama meyl rəsmi ideologiyanı üstələyir. Başqa bir tərəfdən, bolşeviklər dinə və xüsusilə, İslama qarşı mübarizədə həm ideloji-siyasi təbliğat vasitələrindən istifadə etməklə gerçək dini maarifin qarşısını alır və islam dəyərlərini təhrif edir, həm də zorakılıq yolu ilə təsisatları və məscidləri, müqəddəs ziyarət yerlərini məhv edir, onların yerinə anbar və bu tipli binalar tikirdilər. Hətta məscid və ziyarətgahları partladıb darmadağın etməkdən belə çəkinmirdilər. Bunda məqsəd isə dini atributları ictimaiyyətin və xüsusilə yeni nəslin şüurundan silmək olub. Azərbaycanın əksər bölgələrində məscidlər, minarələr sökülmüş, ümumi bina isə təsərrüfat işləri üçün istifadə edilmişdir. Yeni nəsil bunlardan xəbərsiz idi. Digər bir tərəfdən ruhanilər və dini şəxslər təqib edilirdi, hətta dindən uzaqlaşanlara allahsızlıq kitabçası kimi vəsiqə verilirdi. Təkcə Quran və islam maarifinə aid dini kitablar deyil, ərəb əlifbası ilə yazılmış çoxlu elmi, fəlsəfi, mühüm əhəmiyyət kəsb edən tarixi və ədəbi sərvətlər də məhv edilirdi. Əslində xalqın tarixi yaddaşının üstündən qələm çəkmək siyasəti yeridilirdi.

Ulu öndər Heydər Əliyev çıxışlarında bu barədə acı təəssüf hissi ilə dönə-dönə danışır. "Bibiheybət" məscidini 1994-cü ildə ziyarət edərkən bu müqəddəs ocağını necə vəhşiliklə dağıdılmasını yada salır. Burada yeni bir məscidin tikilməsi barədə qərar verir. Bu məscid kompleksi 1998-ci ilin may ayında tikilib başa çatdı və Prezident həmin açılışda çıxış edərək bir daha göstərdi ki, nə fiziki zor və məhvetmə, nə də siyasi-ideloji təbliğat maşını insanların etiqadını sındıra bilmişdir.

Ümummilli lider Heydər Əliyev 1-2 oktyabr 1998-ci ildə Bakıda Qafqaz Müsəlmanları İdarəsinin Elmi-Dini Şurasının keçirdiyi "Müasirlik və dini-mənəvi dəyərlər" adlı Beynəlxalq konfransda bu barədə bəhs edərək belə söyləmişdir: "Təsəvvür edin, o yer müqəddəs yerdir. Orada VIII əsrdə həzrəti Hökumənin qəbri olmuşdur. İmam Rzanın bacısı həzrəti Hökumənin qəbri üzərində vaxtilə insanlar məscid qurmuşdular və ora ziyarətgaha çevrilmişdi. Ancaq o müqədəs yer, müsəlmanların, tək Azərbaycandan yox, dünyanın bir çox yerlərindən gələn müsəlmanların ziyarət etdiyi müqəddəs ocaq 1933-cü ildə partladılmışdır, dağıdılmışdır. Məscidi partladıblar, dağıdıblar, yerlə yeksan ediblər, amma insanlar ayağını o yerdən çəkə bilməyiblər. Həmişə "Bibiheybət" piri bizdə ona pir deyirlər - müsəlmanların ziyarət yeri olubdur, müsəlmanlar gedib orada, o yerə öz ehtiramını bildiriblər, Allah yolunda nəzirlərini veriblər və o yeri yaşadıblar" [İsgəndərov, 2008, s. 49].

Ulu öndər Heydər Əliyev həmin konfransda bu tipli başqa faktları da yada salır. Belə ki, Sovetlər zamanı İslama qarşı aparılan mübarizə nəticəsində yüzlərlə məscid və ziyarətgah məhv edilmişdi. Azərbaycan müstəqillik əldə edərkən ölkədə cəmi 18 məscid fəaliyyət göstərirdi. Lakin qısa bir vaxtda, yəni 7 il ərzində 1000-dən artıq məscid tikilmişdir. O, bu barədə sözlərini belə yekunlaşdırır: "İndi Azərbaycanda 1000-dən

artıq məscid var. Deməк, insanların hamısının qəlbində məscid intizarı, məscid arzusu (məscid Allah evidir) o qədər yaşayıb ki, qısa bir zamanda hökumətin, dövlətin heç bir köməyi vəsaiti olmadan məscidlər tikilibdir. Bu mənim dediklərimə əyani sübutdur"[İsgəndərov, 2008,s.52].

## Nəticə

Görkəmli dövlət xadimi Heydər Əliyev İslam dəyərlərini xalqımızın milli sərvəti kimi dəyərləndirdiyi barədə fikirlərini açıqlayaraq belə demişdir: «Xalqımızın çoxminillik tarixi var və çox əsrlərdir ki, İslam dininə itaət edirik. İslam dini bizim doğma dinimizdir. Xalqımızın milli-mənəvi dəyərləri, dinimizin adət-ənənələri və dəyərləri hamısı birlikdə bizim milli sərvətimizdir. Biz fəxr edə bilərik ki, xalqımız çox dəyanətli xalqdır və zaman-zaman, əsrlər boyu cürbəcür məhrumiyyətlərə məruz qalaraq bütün bu adət-ənənələri unutmayıb. Nə vaxt ki, rəsmi dairələr bunu qadağan edib, yaxud da buna mənfi münasibət göstərib, insanlar bunu qəlbində, öz ailəsində, evində yaşadıblar. Hətta bizim bəzi fədakar insanlar bu adət-ənənələrimizi yaşatdıqlarına görə çox əziyyətlər çəkiblər, bəzən də məhrumiyyətlərə, cəzalara məhkum olublar». Heydər Əliyevdən gətirdiyimiz kəlamlar onun xalqımızın ümumi və bəşəri dəyərlərə yiyələnməsində İslamın rolunu yüksək qiymətləndirdiyini göstərir. Məqalədə Ulu öndər Heydər Əliyevin dövlət-din münasibətlərinin qanunçuluq bazasının yaradılmasında, normativ hüquqi sənədlərin ardıcıllıqla həyata keçirirlməsində, milli-mənəvi dəyərlərimizin qorunmasında və inkişafında misilsiz xidmətlər göstərdiyini nümayiş etdirməsi əks olunubdur.Möhtərəm prezidentimiz Cənab İlham Əliyev bugün də, dövlət-din münasibətlərində yaranmış ənənəni uğurla davam etdirir.

## Ədəbiyyat

1. Əliyev Heydər. Xalqımızın birliyi və dövlətimizin düzgün siyasəti sayəsində müstəqilliyimizi qoruyub saxlayacaq, daha da möhkəmləndirəcəyik // "Azərbaycan" qazeti, 28 may 1998
2. Qurani-Kərim. B., 1997. 302 səh
3. Qətiyyətin təntənəsi (sənədli xronika). B., "Azərnəşr", 1995
4. Əliyev Heydər (1). Müstəqillik yolu (Seçilmiş fikirlər). B., 1997
5. Əliyev Heydər. Azərbaycan XXI əsrin və üçüncü minilliyin ayrıcında. Yeni 2001-ci il, yeni əsr və üçüncü minillik münasibətilə Azərbaycan xalqına müraciət // "Azərbaycan" qazeti, 30 dekabr 2000, 15 səh
6. İsgəndərov Anar. Təzəpir, B., "Qismət", 2008, 152 səh
7. Əliyev Heydər (2). Azərbaycanın dövlət müstəqilliyi əbədi, dönməz və sarsılmazdır. "Azərbaycan" qazeti, 28 may 1997, 16 səh
8. Əliyev Heydər. Azərbaycan dövləti bundan sonra da yaşayacaq və müstəqilliyi əbədi, daimi olacaqdır // "Respublika" qazeti, 18 oktyabr 2001, 14 səh
9. Əliyev Heydər. Müstəqil Azərbaycan hüquqi dövlət quruculuğu, demokratiya və bazar iqtisadiyyatı yolu ilə inamla irəliləyir / "Respublika" qazeti, 18 oktyabr 2002, 15 səh

## İslamic values and tolerance in the heritage of national leader HeydarAliyev

**Summary**

In the article after the return to power of Heydar Aliyev implemented important measures towards analyzes the issues of regulation of relations between state and religion. National treasure of the azerbaijani people, the great leader of Islamic values as tolerance towards the creation of research and analysis services brought to our country. The article also tolerant environment in our country of the great leader in the creation of services were also considered.

## Исламские ценности и толерантность в наследии Общенационального лидера Гейдара Алиева

**Резюме**

После возвращения Общенационального лидера Гейдара Алиева к политической власти, им были приняты множество мер, направленных на осуществление важных мер. В статье анализируются вопросы регулирования отношений между государством и религией, которые заняли важное место в политике Великого лидера. Гейдар Алиев всегда уделял большое внимание таким ценностям, как Ислам, толерантность в нашей стране. Политика, проводимая Общенациональным лидером была направлена на создание атмосферы взаимопонимания и толератности.

**Rəyçi: dos.F.Hüseyn**

Göndərilib: 23.03.2020 Qəbul edilib: 27.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/119-120

**Гюнель Садагат гызы Алиева-Мамедова**
Бакинский государственный университет
gunel-aliyeva-mamedova@hotmail.com

# ОСНОВНЫЕ НАПРАВЛЕНИЯ ТУРЕЦКО-АЗЕРБАЙДЖАНСКИХ ТОРГОВО-ЭКОНОМИЧЕСКИХ ОТНОШЕНИЙ

***Ключевые слова:*** *Турция, Азербайджан, внешняя политика, экономика*
***Açar sözlər:*** *Türkiyə, Azərbaycan, xarici siyasət, iqtisadiyyat*
***Key words:*** *Turkey, Azerbaijan, external policy, economy*

## Введение

Турция является первым государством, признавшим независимость суверенной Азербайджанской Республики 9 ноября 1991 года, на сегодняшний день Турция - стратегический партнёр Азербайджана в мировой политике и государство, оказывающее Азербайджану всестороннюю поддержку (2).

3 мая 1992 года, в ходе официального визита в Баку правительственной делегации Турции были установлены дипломатические отношения между Турцией и Азербайджаном. Подписание 20 сентября 1994 года «Контракта века», с зарубежными компаниями «Тюрк петроллары» было реальным проявлением развития стратегического сотрудничества между Турцией и Азербайджаном. Во всех пяти международных консорциумах, связанных с азербайджанским нефтегазовым сектором, имеется доля турецкого капитала (2).

Подписанные между Турцией и Азербайджаном важные соглашения об экономическом сотрудничестве "Соглашение о сотрудничестве в сфере туризма между Правительством Азербайджанской Республики и Правительством Турецкой Республики", "Соглашение о торгово-экономическом сотрудничестве между Правительством Азербайджанской Республики и Правительством Турецкой Республики", "Протокол о научном, техническом и экономическом сотрудничестве в сфере сельского хозяйства", "Протокол о сотрудничестве и взаимной помощи в таможенной сфере между Азербайджанской Республикой и Турецкой Республикой" и многие другие еще раз доказывают развитие турецко-азербайджанских интенсивными темпами.

На проходящем в азербайджанской столице военном параде по случаю 100-летия освобождения турецкими войсками Баку президент Азербайджана Ильхам Алиев отметил, что «Азербайджан вложит в турецкую экономику $20 млрд. Мы успешно реализуем совместные энергетические и транспортные проекты, которые создают энергетическую и транспортную карты Евразии». Показателем высокого уровня доверия и отношений между двумя государствами Ильхам Алиев назвал состоявшиеся в 2018 году шесть встреч с президентом Реджепом Тайипом Эрдоганом (3).

В 2003 году в Азербайджане насчитывалось 8 турецких строительных проектов стоимостью 55 млн долларов, а в 2007 г. статистические данные указывают 6 проектов стоимостью 849 млн долларов.

В целом, Азербайджан является одним из важных рынков сбыта турецких товаров на Кавказе. Турецкий экспорт в Азербайджан за 10 лет (2001-2011 гг.) вырос более чем в 9 раз (4).

Если в 2010 году удельный вес лиры в экспорте составлял всего 2,6 процента, то сейчас этот показатель превысил 13 процентов. В импорте доля национальной валюты Турции за тот же период выросла с 3,1 до почти восьми процентов.

Уже в 2017 году по данным Государственного таможенного комитета Азербайджана, товарооборот с Турцией составил 2,64 миллиарда долларов, из которых на экспорт в эту страну пришлось 1,37 миллиарда долларов. Товарооборот между двумя странами в 2017 году вырос на 14,8 процента (5).

Как полагает турецкий политолог Энгин Озер «И к тому, что страны региона поддерживают призыв Турции по осуществлению товарооборота в национальной валюте, следует относиться нормально. На самом деле инициативу, с которой выступила Турция, можно назвать проектом по очистке торговли во всей Азии от доллара и евро. Если эта попытка Турции станет успешной, то во многих развивающихся странах будут функционировать биржи, которым не будут угрожать финансовые спекулянты. Как известно, в африканских странах, где роль резервной валюты исполнял доллар, стали предпочитать китайские юани. Кроме этого, я считаю, господство американского доллара на рынке имеет психологические причины» (6).

В 2019 году доля товарооборота между двумя странами составила 13,54% от общей внешней торговли, объем экспорта Азербайджана в Турцию составил $2 млрд 862 млн 694 тыс.

В отчетном периоде импорт Азербайджана из Турции составил $1 млрд. 646 млн. 801 тыс. (7).

Говоря об основных статьях импорта Турции следует отметить: нефть, промышленное сырьё, машины и оборудование, строительные материалы, автомобильные двигатели, потребительские товары, железо и сталь, химикаты, удобрения, крупный рогатый скот.

Основные же статьи экспорта Турции: сельскохозяйственные продукты и продукты питания (включая финики, орехи, сухофрукты) текстиль и одежда, табак, кожа, стекло, очищенная нефть.

Природные ресурсы: хром, медь, ртуть, сурьма, уголь, нефть, природный газ, железная руда, соль. Развита чёрная и цветная металлургия, машиностроение и металлообработка, судостроение, химическая, нефтеперерабатывающая, текстильная и пищевая области промышленности (1., с.1273).

Лондонский еженедельник «Economist» в специальном докладе, посвященном анализу современной ситуации в Турции, обратил внимание «на необычно высокую активность» в ее национальном хозяйстве и отметил, что «темпы развития страны будут, по всей вероятности, более значительными, чем почти в любой европейской стране». В 2011 году Турция оказалась на 3-м месте в мире после Китая и Сингапура, без учета некоторых небольших стран, не играющих заметной роли в мировом хозяйстве (8).

## Заключение

Таким образом, Турция – первая, признавшая независимость Азербайджана, уделяет особое внимание развитию не только политического, но и торгово-экономического сотрудничества двух стран. С каждым годом всё больше растёт товарооборот двух стран, приводя к усилению обоих государств в регионе Ближнего и Среднего Востока, Южного Кавказа.

## Литература

1. Новейший энциклопедический словарь. 20000 статей. // под ред. Варшавской Е. М.: АСТ, 2004, 1424 с.
2. https://cyberleninka.ru/article- Исмаилова Л. Азербайджано-турецкое экономическое сотрудничество и основные направления его совершенствования
3. https://interfax.az/view/743875 - Азербайджан расширяет сотрудничество с Турцией во всех направлениях – Алиев
4. https://cyberleninka.ru/article - Пестрецов А., Бабиров И. Азербайджано-турецкие отношения: достижения и проблемы
5. https://1news.az/news - Турция и Азербайджан перейдут на торговлю в нацвалютах
6. https://kafkassam.com - Турция объявила войну доллару и призывает подключиться Азербайджан
7. https://abc.az/ru/news/39645 - Азербайджан увеличил экспорт в Турцию более $ 1млрд.
8. https://www.webeconomy.ru/ - экономика Турции

## Türkiyə-Azərbaycan ticarət-iqtisadi əlaqələrinin əsas istiqamətləri

### Xülasə

Bu gün dünyada ticari və iqtisadi əlaqələr dünyanın istənilən ölkəsinin uğurlu inkişafına, bütövlükdə hər bir ölkənin siyasi sabitliyinə təsir edən güclü bir amildir.

Türkiyə və Azərbaycan da xarici siyasətdəki bu vacib göstəricilərə diqqət yetirirlər. Hər il Türkiyə ilə Azərbaycan arasında ticarət artaraq, Yaxın və Orta Şərq bölgəsində, Cənubi Qafqazda hər iki dövlətin güclənməsinə səbəb olur.

## The main directions of Turkish-Azerbaijani trade and economic relations

### Summary

Today, trade and economic relations in the world are strong factor that affects the successful development of any country in the world, as well as the political stability of each country as a whole.

Turkey and Azerbaijan also pay attention to these important indicators in foreign policy. With each year, trade between Turkey and Azerbaijan is growing, leading to the strengthening of both states in the region of the Middle East, the South Caucasus.

**Rəyçi: dos.A.Məmmədli**

Göndərilib: 18.03.2020 Qəbul edilib:19.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/121-124

**Samir Zülfüqar oğlu İsgəndərli**
Azərbaycan Turizm və Menecment Universiteti
samir_isgenderli@mail.ru

# MÜASİR BEYNƏLXALQ MÜNASİBƏTLƏRDƏ QLOBALLAŞMA VƏ MİLLİ-MƏDƏNİ KİMLİK

***Açar sözlər:*** *beynəlxalq münasibətlər, qloballaşma, milli-mədəni kimlik*
***Key words:*** *international relations, globalization, national-cultural identity*
***Ключевые слова:*** *международные отношения, глобализация, национально-культурная идентичность*

Qloballaşmanın milli dövlət və mədəniyyətə-mentalitetə təsiri ilə bağlı bir sıra nəzəriyyələr mövcuddur. Hətta qloballaşmanın məhz bu nəticələrini qabardan, onun milli dövlətçiliyə, milli mədəniyyətə və adət-ənənələrə mənfi təsir göstərəcəyini vurğulayaraq onunla mübarizəni özünün əsas məqsədi sayan ümumdünya hərəkatı - antiqlobalistlər hərəkatı da mövcuddur. Əslində qlobalistikanın bir elm kimi yaranması da qlobal problemlərin tədqiqinin zəruriliyi ilə sıx əlaqədardır. Milli, regional və dünya səviyyəli münaqişələrin yaranması təhlükəsi bir çox hallarda dünya iqtisadiyyatının qloballaşması prosesinin yaratdığı üstünlüklərin qeyri-bərabər bölüşdürülməsi ilə də əlaqələndirilir [1, 402].

Qloballaşmanın mümkün nəticələrinin müəyyənləşdirilməsi baxımından kulturoloji amillər, onların milli mədəniyyətlərin dəyər-normativ əsaslarına təsiri hökmən nəzərə alınmalıdır. Tarixən təşəkkül tapmış lokal (milli) mədəniyyətlərin qlobalizasiya dövründə taleyi necə olacaq? Bu proses mədəni müxtəlifliyin qorunub saxlanılmasına kömək edəcək, yoxsa bəşəriyyətin mədəni eyniləşməsi, müxtəlif mədəniyyətlərin hansısa vahid və hamı üçün ümumi qlobal mədəniyyətlə əvəzlənməsi baş verməkdədir? Bu məsələlər bu gün ən müxtəlif cavablar doğuran suallardır. Milli şüurun dirçəldilməsi, qloballaşma ilə əlaqədar mərkəzdənqaçma qüvvələrinin dağıdıcı təsirinə qarşı cəmiyyətin özünüqoruma reaksiyası kimi ortaya çıxır. Qloballaşma bir tərəfdən vahid iqtisadi, siyasi, informasiya məkanının formalaşması üçün real imkanlar açırsa, digər tərəfdən, o müxtəlif inkişaf mərhələlərində, necə deyərlər "müxtəlif start vəziyyətləri"ndə olan, unikal mənəvi, mədəni dəyərlərə malik birliklər qarşısında ciddi tələblər qoyur. Bir sıra hallarda qloballaşma mədəniyyətlər arasında mövcud münaqişələrin kəskinləşməsinə, yeni münaqişələrin yaranmasına, milli ənənələrin sıradan çıxmasına gətirib çıxarır.

Qloballaşma milli mədəniyyətlər arasındakı əvvəllər mövcud olmuş maneələri aradan qaldırmaqla mədəniyyətlərin qarşılıqlı əlaqə və təsir formalarının və səviyyələrinin də genişlənməsinə səbəb olur. Qlobal mədəniyyətinin təşəkkül tapması ilə yanaşı mədəniyyətlərin inkişafında digər tendensiya da özünü göstərməkdədir - mədəni müxtəlifliyin getdikcə zəifləməsi və milli mədəni dəyərlərin eyniləşməsi (unifikasiyası). Beynəlxalq mədəni əməkdaşlığın genişləndiyi, mədəniyyətin xalqlararası kommunikasiyanın əsas formalarından birinə çevrildiyi zamanda milli identikliyin qorunması zəruriliyi problemi daha da aktuallaşır. Qloballaşma dövründə mədəniyyətlərin unifikasiyası təkcə ayrı-ayrı mədəni formaların itməsi ilə deyil, həm də mədəni yekcinsliyin insanların təfəkkür tərzinin, dünyagörüşünün yekcinsləşməsinə gətirib çıxarması ilə təhlükəlidir. Məhz bu təhlükə müxtəlif beynəlxalq təşkilatların, o cümlədən BMT və YUNESKO-nun mədəni müxtəlifliyin qorunmasına yönəlmiş bir sıra qərarlar qəbul etməsinə səbəb olmuşdur. Eyni zamanda qloballaşma xalqlar və ölkələr arasında mədəni bərabərsizliyin getdikcə dərinləşməsinə səbəb olur. Təhsilin səviyyəsinə, mədəniyyət müəssisələrinin sayına və onlardan istifadənin həcminə, fərdi kompüterlərlə təminata, ən nəhayət dövlətin mədəniyyət sahəsinə ayırdığı vəsaitlərin həcminə və göstəricilərinə görə lider dövlətlərlə autsayder dövlətlər arasında fərqlər getdikcə artmaqdadır. İqtisadi, texnoloji bərabərsizliklə yanaşı mədəni bərabərsizlik bu gün ictimai tərəqqiyə əsas maneə olaraq qalmaqdadır. Çox təəssüf ki, qlobalizasiya müxtəlif ölkələrin mədəni inkişafı arasındakı fərqləri nəinki aradan qaldırmır, əksinə, daha da dərinləşdirir. Ölkələrin inkişafının əsas göstəricisi olan insan potensialının səviyyəsindəki bu fərqlər bir sıra hallarda autsayder ölkələrdə fanatizm, millətçilik, radikalizm, ekstremizm kimi meyllərin artması ilə müşayiət olunur. Bir tərəfdən bəzi ölkələrdə və regionlarda mədəni geriliyin səbəbi kimi qərbin mədəni müdaxiləsi göstərilir, digər tərəfdən isə "Faust sivilizasiyasına" məxsus birliklərin siyasi, iqtisadi və mədəni üstünlüyünün ideoloji və coğrafi cəhətdən əsaslandırılmasına, "avrosentrizm" konsepsiyasının yenidən dirçəldilməsinə cəhdlər göstərilir. Müasir dünya milli-mədəni müxtəlifliyin vəhdəti kimi çıxış edir. Milli mədəniyyətlərin zənginliyi bütün bəşəriyyətin mənəvi zənginliyi deməkdir. Buna görə də hər bir milli mədəniyyət dəyərsiz sərvət olaraq diqqət və qayğı tələb edir.

Xalqların öz mili-mədəni varlıqlarını qoruyub inkişaf etdirmək cəhdlərini köhnəliyin qalığı kimi qəbul edən qloballaşmanın qızğın tərəfdarlarından fərqli olaraq, mədəniyyət heç zaman mücərrəd, ümumbəşəri xarakter almayacaq, o həmişə konkret, milli formada inkişaf edəcəkdir. Qloballaşma məddahlarının nəzərincə, milli mədəniyyətlər öz potensialını itirmiş cəmiyyətlərin dəyərlərini qoruyub saxlamağa çalışan elementlər rolunda çıxış edir və dünya qlobal sisteminə daxil olmağa mane olur [2,170].

Eyni zamanda məlum həqiqətdir ki, mədəniyyət mahiyyətcə özünəməxsus, milli olsa da, o təcrid olunmuş şəkildə inkişaf edə bilməz. Milli mədəniyyət yalnız digər mədəniyyətlərlə qarşılıqlı əlaqəyə girərək, qarşılıqlı şəkildə zənginləşərək, özgünlüyünü saxlamaqla, ümumbəşəri mədəniyyət səviyyəsinə qalxa bilər. Bu baxımdan milli və ümumbəşəri mədəniyyətləri tam və hissələrin münasibətləri kimi də səciyyələndirmək olar. Müasir dünyada biz milli özünüdərkin, milli identikliyi inkişafının şahidi oluruq. Milli dəyərlərə sadiqlik, məxsus olduğu millətin, xalqın, etnosun sosial, iqtisadi, siyasi, mənəvi inkişafına nail olmaq arzusu, digər millətin mənəvi dəyərlərinə hörmət etməklə, milli bərabərlik prinsipinə riayət etməklə mümkündür. Əks halda bu məxsus olduğu xalqın mənafeyinin və maraqlarının mütləqləşdirilməsinə, milli eqoizmə, milliyyətçiliyə gətirib çıxarır. V.S.Malaxova görə, etnik millətçilik üçün öz xalqının dəyərlərinin, imperativlərinin, ümumi tarixinin, linqvistik və mədəni homogenlik haqqında miflərinin şişirdilməsi kimi keyfiyyətlər xasdır. Etnik millətçi üçün onun mədəniyyəti, dili, adət-ənənələri, həyat tərzi digər millətlərinkindən mütərəqqi olduğundan üstün tutulmalıdır. Milli müstəsnalıq iddiası, etnik lovğalıq son nəticədə etnik münaqişələrə, regional müharibələrə gətirib çıxarır ki, bundan da nəinki qonşu xalqlar, elə birinci növbədə etnomillətçilik xəstəliyinə tutulmuş xalqın özü zərər görür. Etnik millətçiliyin ən mühüm təzahürlərindən biri nəyin bahasına olursa olsun öz dövlətçiliyinə nail olmaq iddiasıdır. Onların nəzərincə dövlət yalnız bir millətin nümayəndələrindən ibarət olmalıdır. Dövlətçiliklə bir etnik millətin sərhədlərini uyğunlaşdırmaq tələbləri təhlükəli vəziyyətlərə və münaqişələrə, məcburi deportasiyaya, genosidə gətirib çıxarır, polietnik dövlətdə yaşayan bütün digər xalqları tabe vəziyyətinə salır [3,309].

Qloballaşma xalq mədəniyyəti, elitar mədəniyyətlə kütləvi mədəniyyətin qarşılıqlı münasibətlərində də köklü dəyişikliklərə gətirib çıxarmışdır. Bir yandan, biz birinci tip mədəniyyətin statusunun getdikcə aşağı düşməsi meylləri ilə rastlaşırıq, digər tərəfdən kütləvi mədəniyyətin postindustrial cəmiyyətin mədəniyyətin sisteminin əsas elementinə çevrildiyini müşahidə edirik. Formalaşmaqda olan qlobal mədəniyyətə bir sıra hallarda milli mədəniyyətlərin qlobal qərbləşməsi (vesternizasiya) prosesi kimi baxırlar, bunun da əsasında qərb həyat və davranış tərzinin, təfəkkür formalarının qlobal hücumu, qərb, əsasən Amerika mədəniyyət nümunələrinin geniş yayılması durur. "Universal sivilizasiya" konsepsiyası da məhz qərbin mədəni ağalığına bəraət qazandırmaq məqsədi güdür. P.Berqer, R.Robertcon və b. mədəni qloballaşmanın məhz bu neqativ nəticələrini vurğulayırlar. Kütləvi mədəniyyətin sürətlə yayılması ənənəvi milli mədəniyyətlər üçün əsil təhlükə yaradır. XXI əsrdə bu meyil getdikcə genişlənməkdədir. Qloballaşma proseslərinin təsiri nəticəsində mədəniyyətin əmtəəyə, xidmətə çevrilməsi təhlükəsi də artmaqdadır. Kütləvi mədəniyyətin nəticəsi olan unifikasiyaya (eyniləşməyə) qarşı özünü qorumaq reaksiyası kimi mədəni separatizm meyli ortaya çıxmaqdadır. Müasir dünya qütbləşməkdədir. ABŞ tədricən öz müstəsna liderliyini itirir, yeni güc mərkəzləri (Çin, Hindistan, Cənub-Şərqi Asiya, Türkiyə) yaranır.Həyat tərzlərinin, mədəni simvolların eyniləşməsi, bəsitləşməsi nəticəsində universallaşma prosesi sürətlənir və genişlənir. Qloballaşma qərb və amerikan dəyərlərini, normalarını, həyat tərzini bütün dünyaya yaysa da, onlar digər mədəniyyətləri əvəz etmək iqtidarında deyillər. Nəticədə mədəniyyətlərin toqquşması, münaqişəsi təhlükəsi yaranır.Qlobalizasiya milli-mədəni identiklik problemini daha da mürəkkəbləşdirir, bir çox xalqları "biz kimik"? sualına cavab axtarmağa sövq edir. Bu böhranın bariz göstəricilərindən biri də milli dillərin statusunun aşağı düşməsi, mədəniyyətlər arası ünsiyyətin yeganə vasitəsi kimi ingilis dilinin bərqərar olmasıdır.

Bu təzahürlər öz növbəsində öz dilini və mədəniyyətini əziz tutanların etirazlarına səbəb olur. Hətta bəzi ölkələr (Tanzaniya, Keniya, Malayziya) rəsmi dil kimi ingilis dilindən imtina etdiklərini bildirmişlər. Müxtəlif mədəniyyətlər arasında qarşılıqlı əlaqənin əsas forması kimi mədəni müdaxilə çıxış edir ki, onun əsas göstəricisi bir mədəni dəyərlər sisteminə digər mədəni dəyərlərin nüfuz etməsidir. Xüsusən, son iyirmi ildə müxtəlif ölkələrin mədəni məkanına Amerika kütləvi mədəniyyətinin güclü müdaxiləsi milli mədəniyyətləri qoruyub saxlamaq istəyənlərin ciddi narahatçılığına səbəb olmuşdur. Amerika siyasi və intellektual elitasının bir çox nümayəndələri Amerika kütləvi mədəniyyət dəyərlərinin digər mədəni sivilizasiyalara qəbul etdirilməsinin şüurlu şəkildə həyata keçirdiyini, ABŞ xarici siyasətinin mühüm elementi olduğunu açıq etiraf edirlər.Tanınmış ABŞ siyasi xadimi Henri Kissencer 1999-cu il oktyabrın 12-də Trinti kollecində (Dublin, İrlandiya) çıxışında açıq şəkildə etiraf etmişdir: "Əsas çağırış ondan ibarətdir ki, adətən qloballaşma adlanan şey əslində Birləşmiş Ştatların hakim rolunun başqa adıdır [4,15].

Buna bir sıra hallarda standart kimi qəbul edilən Amerika siyasi ənənələrinin demokratik idealları da şərait yaradır. Bütün bunlar isə "Amerika mədəni imperializminin" sürətlə yayılmasına gətirib çıxarır.Mədəni

qloballaşmanın bu neqativ təzahürlərinə diqqət yetirən pessimistlərin nəzərincə nunun ən mənfi nəticəsi, demək olar ki, bütün milli mədəniyyətlərin təməl strukturlarına güclü zərbə vurması, "mədəni Çemobıl"ın yaranma təhlükəsidir. Dünyagörüşündə dəyişikliklərə yol açır. Qloballaşma əleyhdarlarının fikrincə, bu ümumdünya prosesi müstəmləkəçiliyin yeni növünün, mədəni "imperializmin" yaranmasına gətirib çıxarmışdır.

1960-cı illərdə yaranmış bu konsepsiyaya görə müstəmləkəçilikdən azad olmuş və inkişaf etməkdə olan ölkələr keçmiş metropoliyalar tərəfindən dünya informasiya axınına cəlb edilməklə müstəmləkəçiliyin yeni forması elan mədəni müstəmləkələrə çevrilmişlər. Mədəni imperializm sənayecə inkişaf etmiş ölkələrin kütləvi kommunikasiya vasitələrinin istehsalı və yayılması texnologiyası sahəsində üstünlüyü üçüncü dünya ölkələri əhalisinin şüuruna yad mədəni dəyərlərin, davranışın norma və nümunələrini yeritməyə şərait yaradır.

İnformasiya məkanında əsasən ABŞ və qərb kütləvi informasiya vasitələri üstünlük təşkil etdiyindən Amerika həyat tərzinin dəyərləri üçüncü ölkələrin ənənəvi mədəniyyətini sıxışdırıb çıxarır və onların milli identikliyinə sarsıdıcı zərbə vurur Yeri gəlmişkən, antiqlobalizm hərəkatının ideya əsasını da məhz mədəni imperializmin tənqidi təşkil edir. İnkişaf etmiş ölkələrin digər müstəqil dövlətlərin milli maraqları, norma və ənənələri ilə hesablaşmamaları, dövlətlərin suverenliyini məhdudlaşdırmaq, bütün sivilizasiya strukturlarım avrosentrik modelə uyğunlaşdırmaq cəhdləri qloballaşmanın gizli tərəfləridir.

Belə şəraitdə "Mədəni təcridçilik" qloballaşmanın qərbin hegemoniyaına, onun mədəni dəyərlərinin zorla qəbul etdirilməsi kimi çıxış edən formalarına təbii reaksiyası kimi çıxış edir. Bunun ən bariz nümunəsi kimi İranda antişah inqilabını göstərirlər. Lakin başqa nümunələr də mövcuddur. Cənubi-Şərqi Asiya ölkələri, xüsusən Yaponiya qlobal maliyyə-iqtisadi və texnologiyalar şəbəkəsinə uğurla inteqrasiya olunaraq, eyni zamanda öz mənəvi-mədəni özgünlüyünü də qoruyub saxlayırlar. Xüsusən Yaponiya üçün qlobalizm bir o qədər də təhlükəli deyil. "Yapon ruhu, qərb texnologiyaları" ideyasına sadiq qalan bu ölkə ümumdünya birləşdirici və eyniləşdirici proseslər şəraitində belə öz etnik identikliyini cəsarətlə müdafiə edir. Bu sözləri eyni ilə"Qlobal düşün, lokal hərəkət et" prinsipi ilə yaşayan Cənub-Şərqi Asiya ölkələri haqqında da söyləmək olar. Rus alim N.D.Nikandrovun fikrincə, qlobal mədəniyyət iqtisadi, siyasi və ideoloji rəqabətin mövcudluğu şəraitində mümkün deyildir. Əgər mədəniyyətin əsasını dilin təşkil etdiyini nəzərə alsaq, onda qlobal mədəniyyətə çağırış, elə qlobal dilə çağırış deməkdir ki, bunu nə rasional, nə də emosional səviyyədə heç kim müdafiə etməyəcəkdir. Bunun ən bariz nümunəsi ABŞ-da 18-ci əsrdən mövcud olan əridici qazan (meltinq pot) siyasətinin iflasa uğramasıdır. Bu ideya artıq tarixə qovuşsa da, ölkədə dil və mədəniyyət problemləri hələ də qalmaqdadır. Ona görə də qlobalizasiyanın əridici qazan kimi qəbul edilməsi bir mifdir. Çünki fərqlilik, müxtəliflik, ziddiyyət olmadan inkişaf ola bilməz. Deməli qlobal mədəniyyətin özü də mifdir, mədəniyyətlərin, sivilizasiyaların dialoqu isə reallıqdır [5,365].

Lakin "qlobal mədəniyyət" anlayışı heç də bütün dünyanın bölüşdüyü, eyniləşdirilmiş və standartlaşdırılmış dəyərlər məcmusu deyil. Qlobalistlər qərb modelinin həyatiliyini təmin etmək üçün demokratiya, insan hüquqları, iqtisadi inkişaf, yoxsulluqla mübarizə kimi nəcib ideyalardan geniş istifadə edirlər. Əslində isə bunlar bütün dünyada insanların daha da yoxsullaşmasına, var-dövlətin az sayda ölkələrdə və əllərdə cəmləşməsinə gətirib çıxarır. Heç bir dövlət və ya dövlətlər qrupu demokratiya, insan hüquqları naminə belə özünün yeni imperiya məqsədlərini, iradəsini, mənəvi prinsiplərini və istehlakçı etnik normalarını başqalarına diktə etdirməməlidir. Qlobalizasiya prosesinin əsasında elmin, texnikanın, mədəniyyətin, siyasətin ümumi inkişaf qanunauyğunluqlarının təsiri nəticəsində müxtəlif ölkələrin və mədəniyyətlərin yaxınlaşması və görünməmiş intensivlik və miqyas almış dünya informasiya mübadiləsi durur. İqtisadi qloballaşmanın sürətlənməsi, informasiyanın qlobal xarakter alması nəticəsində mədəniyyət öz milli sərhədlərini aşaraq, qlobal bazar mexanizminin təsir dairəsinə cəlb olunur. Mədəni məhsulların istehsalı, bölgüsü və istehlakı milli sərhədləri daha qətiyyətlə aşmaqdadır. Bu zaman əsas mədəni axın "Şimal"dan (Qərbdən), "Cənuba" (Şərqə) yönəlmişdir. Əslində şərti olaraq vesternləşmə (qərbləşmə) adlanan bu istiqamət də mədəni qloballaşmanın bütün aspektlərini tam əhatə etmir. Son dövrlərdə qərb dövlətləri ilə yanaşı bir sıra Asiya və Latın Amerikası ölkələri (O cümlədən Hindistan, Çin, Türkiyə, Braziliya, İran və b.) qlobal mədəni proseslərin fəal iştirakçılarına çevrilməkdədirlər. Hind filmlərinin satışından gələn gəlirin yarıdan çoxu qərb ölkələrinin payına düşür. Nobel mükafatı almış yazıçılar arasında qeyri-qərb yazıçılarının sayı getdikcə artmaqdadır. Bütün dünyada baş verən miqrasiya prosesləri (əsasən "Cənub"dan "Şimal"a) inkişaf etmiş ölkələrin etnik, mədəni landşaftın sürətlə dəyişməsinə, qeyri-qərb mədəni məhsulun (həm simvolik, həm də maddi) istehsalının və istehlakının artmasına ciddi təsir göstərir. Bütün bunlar dünya mədəniyyətində ciddi transformasiya prosesinin başlandığını sübut edir. Lakin hələlik mədəni qloballaşmada qərbin aparıcı rolu qeyd-şərtsizdir. Müasir informasiya vasitələrinin və əlaqələrinin inkişafı sayəsində müxtəlif ölkələrdə yaşayan insanlar millidövlət sərhədlərini aşaraq ən müxtəlif maraqlar üzrə birləşərək ünsiyyətə girirlər. Bu gün incəsənət növünün

həvəskarlarını birləşdirən milli amil deyil, məhz həmin spesifik maraq və tələbatlardır. Bu yeni mədəni birlik tipini səciyyələndirmək üçün ingilis sosioloqu Roland Robertson qlokallaşma terminini tətbiq etmişdir (Qloballaşma və lokallaşma sözlərinin birləşməsi əsasında). Qlokallaşma qlobal dünyada mədəniyyət sahəsində baş verən iki qarşılıqlı əlaqəli prosesi - homogenləşmə (yekcinsləşmə) və heterogenləşmə (müxtəlifliyin saxlanılması) prosesinin nəticəsi kimi başa düşülür [6, 199].

## Ədəbiyyat

1. Manafova M. Mədəniyyət tarixi və nəzəriyyəsi. Bakı: Təbib, 2006, 660 s.
2. Şükürov A. Qloballaşma: mahiyyəti və perspektivləri. Bakı: Adiloğlu, 2001, 133 s.
3. Our creative diversity: report the World Commission of Culture and Development. Paris, UNESCO, 1996, 309 p.
4. Gindlin S.Social Justice and Globolization. Are they Compatible? // Monthly Review. June 2002, 54 p.
5. Horrison L.E, Hungtington S.P. Culture Matters. How Values Shape Human Progress. N.Y., 2000, 371 p.
6. Samovar L., Porter R, Stefani L. Communication between Culture. Belmont. CA, 1998, 436 p.

## Globalization and national-cultural identity in contemporary international relations

**Summary**

In contemporary international relations, in the context of globalization and geopolitical processes, the survival and development of each nation is linked to a number of fundamental factors that have a systemic nature. At the forefront of these factors is primarily national-cultural identity. Especially in the era of globalization, national identity and integration act as a common mechanism that ensures and maintains the integrity of a nation. In other words, national identity is vital element of the integrity and existence of the people and nation.

## Глобализация и национально-культурная идентичность в современных международных отношениях

**Резюме**

В контексте глобализации в контексте современных международных отношений и в контексте геополитических процессов сохранение существования каждой нации и нации связано с рядом фундаментальных факторов, которые носят системный характер. На первый план этих факторов стоит прежде всего национально-культурная идентичность и идентичность. Особенно в эпоху глобализации национальная идентичность, идентичность и интеграция действуют как общий механизм, который обеспечивает и поддерживает целостность нации. Другими словами, национальная идентичность и национальная идентичность являются жизненно важным элементом целостности и существования людей и нации.

**Rəyçi: t.f.d. N.Bədəlov**

Göndərilib: 04.03.2020 Qəbul edilib: 06.03.2020

Hakimiyyətin dördüncü qolu olaraq, media ictimai rəyi formalaşdırır və beynəlxalq münasibətlərin tənzimlənməsində iştirak edir. Media təkcə informasiya məkanını müxtəlif məlumatlarla doldurmur, həm də insanın özünü tanımasına, davranışına və düşüncə tərzinə təsir göstərir.

Bugünkü reallıq ənənəvi medianın yeni media ilə sıx əməkdaşlığını tələb edir. Bəzən bu ümumi məlumat axınında hər hansı bir dəyişikliyi izləmək, meyilləri müəyyənləşdirmək və qarşıdurmanı əngəlləmək, mədəniyyətlərarası konteksti vurğulamaq çətindir. Yayım mövzusuna əsaslanaraq, mədəniyyətlərin dialoqu bəzən proqnozlaşdırıla bilər, amma istər-istəməz gözlənilməzliklər də qaçılmazdır. Buna görə redaktorlar "sensasiya potensialı" olmayan, lakin ictimaiyyət üçün faydalı olacaq materiallara diqqət yetirməlidirlər.

Mədəniyyətlərarası dialoqun qurulması üçün müxtəlif rabitə kanallarından istifadə edilə bilər, bunların arasında İnternet əsas yer tutur. Eyni zamanda, İnternet açıq bir məkandır, burada hər hansı bir istifadəçi ictimai maraqlara və etik normalara məhəl qoymadan öz fikirlərini bildirə, ambisiyalarını reallaşdıra bilər. Bu məqsədlər üçün geridönümü (rəyləri) istisna edən bir monoloq daha uyğundur. Müasir dünyada medianın əlçatanlığı, ifadə azadlığı həmişə konstruktiv dialoqa aparıb çıxarmır.

Mediadan danışarkən xüsusilə sosial medianın insanların, eləcə də cəmiyyətin üzərindəki təsir gücünü unutmamalıyıq. Sosial şəbəkələr bu gün bizim min bir əziyyətlə qorumağa çalışdığımız dəyərlərimizi və meyarlarımızı bir anda yox edə bilər, həm də bunun üçün bizdən icazə istəmir. O, hər birimizin evində, bizimlə birgə mövcuddur və bizə diqtə edir. Nəticədə milli-mənəvi, əxlaqi və ailə dəyərlərimiz sıradan çıxmağa başlayır, yerini bizə yad olan düşüncə və davranışlara verir. Xüsusilə sosial şəbəkələrdə dini motivdə edilən qərəzli paylaşımlar, zorakılığı təbliğ edən videomateriallar dünyanın gələcəyinə ciddi təhdiddir.

Həmçinin 15 mart 2019-cu ildə Yeni Zellandiyada iki məsciddə 51 nəfərin ölümü, 50 nəfərin yaralanması ilə nəticələnən terraktdan əvvəl terrorçu Brenton Tarrant sosial media hesablarında uzun, irqçi sənəd yerləşdirir və terror hadisəsini Facebook-da canlı yayımlayır. Onun adına olan həmin sənədlərdə, sonradan hücum edilmiş məscidlərin adı çəkilir və hücum üçün anti-immiqrant motivasiyalar göstərilir [2].

Nobel mükafatı laureatı Petr Kapitsa media və silahları müqayisə edərək medianın heç də silahdan az təhlükəli olmadığını söylədi. Onun fikrincə media kütlənin rəyinə güclü təsir göstərir, ictimai əhval-ruhiyyəni formalaşdırır, mövzu, şəxsiyyət və hadisələrə müxtəlif xüsusiyyətlər qazandırır, gündəmdəki siyasi strategiyaların həyata keçirilməsinə yardımçı olur.

Mədəniyyətlərin və dinlərin dialoqunda Azərbaycan təcrübəsi bu gün dünyada yüksək qiymətləndirilir və öyrənilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2008-ci ildə sivilizasiyalar arasında dialoqun inkişafını nəzərdə tutan “Bakı prosesi”nin başladılması təşəbbüsü ilə çıxış etdi. 2-3 dekabr tarixində təşkil olunan Avropa Şurasına üzv dövlətlərin mədəniyyət nazirlərinin konfransına Azərbaycanın təşəbbüsü ilə ilk dəfə olaraq 10 islam ölkəsi dəvət edildi. İslam dövlətlərinin iştirakı ilə mədəniyyət nazirlərinin konfransı yeni bir formata transformasiya olundu. Avropa və ona qonşu regionlardan 48 ölkənin, 8 beynəlxalq təşkilatın və bir sıra beynəlxalq qeyri-hökumət təşkilatlarının yüksək səviyyəli nümayəndələrinin iştirak etdiyi bu konfransda “Mədəniyyətlərarası dialoqun təşviqinə dair "Bakı Bəyannaməsi” qəbul edildi [3].

Bu təşəbbüsün davamı kimi 2016-cı il sentyabrın 16-da keçirilən VI Bakı Beynəlxalq Humanitar Forumda müzakirə olunan mövzulardan biri də “Jurnalistikanın informasiya dövrünə transformasiyası və onun sivilizasiyalararası dialoqun təmin edilməsində rolu” idi. Forumda informasiya cəmiyyətində jurnalistikanın inkişafının alternativ modellərinin formalaşması, mədəniyyətlərarası, dinlərarası və sivilizasiyalararası dialoqun təmin edilməsində jurnalistikanın rolu, müasir cəmiyyətin çağırışları kontekstində virtual jurnalistikanın əhəmiyyəti və sosial şəbəkələrin rolu məsələləri müzakirə olundu. “Dəyirmi masa”da dünyanın müxtəlif qitələrindən Bakıya gəlmiş ictimai-siyasi xadimlərin, mədəniyyət nümayəndələrinin, dövlət qurumlarının mətbuat katiblərinin, ekspertlərin, Azərbaycanın ali təhsil ocaqlarının jurnalistika fakültələrinin professor-müəllim heyətinin, nüfuzlu media təşkilatlarının - TASS informasiya agentliyi (Rusiya), İRNA agentliyi (İran), “Qlobalist” jurnalı (Malayziya), “World Investors TV” (Yaponiya), TELAM xəbər agentliyi (Argentina), Anadolu Agentliyi (Türkiyə), “Darakçı” nəşriyyat evi (Özbəkistan), “Ruz el-Yusif” qəzeti (Misir) – iştirakı bir daha sübut edir ki, mədəniyyətlərarası dialoqun həyata keçirilməsində medianın rolu əvəzsizdir [4].

Beləliklə, media mədəni əngəllərin aradan qaldırılmasında asanlığı təmin etməli, fərqli mədəniyyətlərin nümayəndələri arasında konstruktiv qarşılıqlı münasibət yaratmalı, mədəniyyətlərarası nifaq və münaqişələrin qızışdırılmasına, bu və ya digər mədəniyyətin nümayəndələri ilə bağlı stereotiplərin formalaşmasına təkan verməməlidir. Bütün bunlar qarşılıqlı anlaşmanı təmin etməyə, sosial gərginliyi aradan qaldırmağa, mədəni davamlılığa ehtiyacı, habelə mədəni ənənələrin qorunub saxlanmasının vacibliyini dərk etməyə imkan verir. Nəticədə media cəmiyyətin inteqrasiyasını təmin etmiş olur.

### Ədəbiyyat

1. Zəfər Nəcəfov "XXI əsrdə etnik münaqişələrin geosiyasi xüsusiyyətləri".
2. https://www.bbc.com/azeri/international-47556769
3. https://az.wikipedia.org/wiki/Bak%C4%B1_Beyn%C9%99lxalq_Humanitar_Forumu#VI_Bak%C4%B1_Beyn%C9%99lxalq_Humanitar_Forumu
4. http://bakuforum.az/az/iii-jurnalistikanin-informasiya-dovrune-transformasiyasi-ve-onun-sivilizasiyalararasi-dialoqun-temin-edilmesinde-rolu/?fid=7401

### Media as a key tool for maintaining intercultural dialogue

**Summary**

The article is about the role of the media in maintaining intercultural dialogue in the modern world, special attention is paid to the Internet, information policy conducted in conditions of information abundance, the influence of social networks on public opinion, the prevention of wars and conflicts, the promotion of peace and intercultural dialogue throughout the world.

### СМИ как ключевой инструмент для поддержания межкультурного диалога

**Резюме**

В статье затрагивается роль средств массовой информации в поддержании межкультурного диалога в современном мире, особое внимание уделяется Интернету, информационной политике, проводимой в условиях большого количества информации, влиянию социальных сетей на общественное мнение, предотвращению войн и конфликтов, содействию миру и межкультурному диалогу во всем мире.

**Rəyçi: dos.İ.Quliyev**

Göndərilib: 12.03.2020 Qəbul edilib: 16.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/137-140

**Tural Novruz Ismayilzadeh**
Baku State University
infoismayilzade@gmail.com

## SOCIAL INNOVATIONS AS SEGMENT OF INFORMATION SOCIETY DEVELOPMENT

***Key words:*** *socium, Steve Jobs, the introduction of information and communication technologies, social innovations, ASAN*
***Açar sözlər:*** *sosium, Stiv Cobs, informasiya-kommunikasiya texnologiyalarının tətbiqi, sosial innovasiyalar, ASAN*
***Ключевые слова:*** *социум, Стив Джобс, внедрение информационно-коммуникационных технологий, социальные инновации, ASAN*

### Introduction

The article discovers the importance of social innovations under the circumstances of ICT as the main driver of public governance, and the role of personal and organizational relationships of the workers belonging to the mentioned sphere in improving the living standards of population; as well as levels of the process of introducing information and communication technologies into our lives.

The article also establishes such indicators of society's needs as individual, group, general consumer, the solution of which mainly depends on the communication and professionalism of workers in this field, who can form public leverage for this sphere. The main attention is paid to understanding the correlation and interaction of people with social innovations and the security system of social technologies. From the methodological perspective, the article is mainly based on such concepts as "sociality", "manufacturability", "safety" and "security".

"Innovations have nothing to do with how much dollars you have. When Apple entered the market with Mac, IBM spent at least 100 times more on research and development (R&D). It is not about the money, but the people you have; how you manage them and how better you understand them." [1]

This is a professional conclusion, an output, that has been reached by Steve Jobs against the background of his successful practice. And really, innovation requires investing more efforts than material capital.

Now, the level of application of information and communication technologies in various sectors of life is the main indicator of the intellectual development and scientific potential of each country and reports on the transparency of that society.

Of course, there were certain problems in the application of new information for many years. And the problems – they exist always and everywhere. But their solution depends on, how we approach to it.

If we want to introduce information and communication technologies into our lives, this requires us to solve the following problems:

- expansion of modern technology and push the importance of "Internet of Things" forward;
- development of such technologies as "5G" and "hologram" technologies;
- improving the quality of television and radio broadcasting of information programs;
- enhancing the number of computer, mobile phone and other technology users;
- improving the legal framework in connection with cyber-attacks in order to preserve identified individual information.

Information and communication technologies become an integral part of our daily activities and social-economic relationships in all sectors of society, while developing intensively.

Social innovation - it is the introduction of novation into social spheres of society with the aim of successful promotion of technological discoveries, resolution of social conflicts and improving the lives of citizens. [2]

The author of definition for "social innovation" is Mohammed Yunus, founder of mechanism of microfinancing and microcredit, winner of Nobel peace price of 2006. But the roots of introduction of these social innovations go further. For instance, in 1774, I.G.Pestalozzi worked over the idea of raising the education of children from the lower layers of society to productive work in order to ensure their future. [3]

Social innovations assist the economic development of society and improve the life quality of population, solve complex situation in society, smooth the transition from one stage of technological processes to another. The objective of those innovations is to establish the balance of social, economic and environmental needs of society.

Ideally, social innovations should be consistent with the structure of a developing society. Then, it will become ideal, and the society will respond.

Currently, world community plans to facilitate solution of five mega-tasks with the help of social innovations: urbanization, environmental friendliness, energy, mobile technologies and healthcare.

"Establishment of space industry in Azerbaijan was the result of practical work implemented in recent years. It means, we should always look forward and see the perspectives. We should not be satisfied just with the achieved successes. A success achieved today should become the foundation for bigger steps tomorrow. Especially, we should always be one step forward, leave both our competitors and the time behind in the field of information technologies developing rapidly all over the world." [4]

This speech was made by President Ilham Aliyev at the expanded meeting of Cabinet of Ministers dedicated to the results of social-economic development in 2009, where he talked about the measures taken for the development of information and communication technologies.

Azerbaijan is a developed industrial-agrarian state with developed manufacturing, where oil and gas production, oil processing industry and other sectors took the most important positions. [5]

After the decision made for transition to information society, new pages have been opened in public life of the country, investments began to be contributed to the development of non-oil infrastructure.

Azerbaijan is stepping up every day for some development indicators. Only according to the Doing Business Report, which was published on October 31, 2018, Azerbaijan progressed from 57th place to 25th in terms of the ease of doing business, thereby obtaining the highest rating among countries in the Europe and Asia region. This rating indicator can be a big step in the subsequent development of ICT. [6]

"Excellent opportunities exist in Azerbaijan for the development of ICT. This is relatively new sector for us. The Ministry of Communication and Information Technologies was established about 5-6 years ago. We managed to achieve big success in this field for a short period of time. World Economic Forum highly appreciates the development of information and communication technologies in Azerbaijan, we occupy one of the leading positions in CIS region, and perhaps even the first." [4]

Azerbaijan's performance in the sphere of ICT is successfully continued over the strategic course, which was laid by the great foresight of Heydar Aliyev, the national leader. The "National Strategy on information and communication technologies for the development of the Republic of Azerbaijan (2003-2012)" approved by him in 2003, provided great opportunities to the rapid development of the country in the field of information and communication technologies.

The mentioned multi-annual state strategy stated the whole public and the world regarding special interest of Azerbaijan for ICT sector.

President Ilham Aliyev expressed the thesis at the Geneva World Summit on the Information Society on December 12, 2003, which has become the main strategy of state policy today: "We will turn "black gold" into "human capital," which will become the foundation of a new stage in the development of the national economy." [7]

In recent years, the development of ICT has become one of the leading factors affecting the development of society. Intensively developing societies enjoy the benefits that are provided to them by information and communication technologies. Today, nobody will doubt that the way towards the establishment of information society is starting point for the future of humankind.

Social innovations – those are ideas, strategies, technologies that contribute to addressing socially significant tasks, leading to social changes in the society. They may include novation made in the system of education, healthcare, communications that use innovative approaches and technologies. [8]

Today, everyone recognizes that innovations are not only the instrument of income, but also it is an opportunity to help in solving global challenges facing humankind. They pose a huge impact on improving life quality of people.

Social innovations are able to satisfy a number of needs of the society, however, there are various attitudes towards them. Some social workers are particularly committed to partnership approach, while cooperating with non-governmental organizations and civil society. Others are not very welcoming to social changes.

The convergence of society plays great role in the introduction of social innovations – when the representatives of various sectors, who worked isolated from each other, unite their efforts for creation of innovative products and services assisting the development of society.

Modern social innovations are aimed at supporting economic progress, ensure the protection of environment and the society. Namely such innovations are socially-significant ones.

Practically, a lot of social innovations have been applied, which have been created by chance, but achieved great success in solving socially-significant problems. Let's show some foreign examples of them:

- ✓ "Saving paper" – one of the printing staff started to realize that large amount of paper was simply thrown away after a working day. He began to collect this paper and make inexpensive notebooks, jewelry, diaries from that material, involving mothers of many children to this work. This program has helped society to recycle and reuse "waste paper". [9]
- ✓ "School grandfathers" - In Sweden, when teachers often lack experience in preventing conflicts, "grandfathers" come to help and this improves the situation in the school. The initiative was launched in a small Swedish town in 1996, when about 1,000 unemployed men between the ages of 50 and 65 began to go to school - but not as teachers. They began to participate in the life of the school, helping children and teachers. [10]
- ✓ "Big Newspaper" – one of the successful projects in Great Britain, where one organization produces a professional magazine and sell it to homeless people for half price, who in turn, sell those magazines to the people passing through the streets at full price. This project helps homeless to develop important skills, adapt in society and continue to find work. [11]
- ✓ "Save the Food" - the project is designed to unite those who need food with those who are ready to share their food. According to the project, Finland has created special mobile applications and shelters that bring together those in need of free meals, which usually include students, large families, the elderly, homeless people and others. [12]

The biggest step in introducing social innovations in Azerbaijan is the establishment of an innovation center of ASAN community service that implements various social programs.

"ASAN"– is the State Agency for Public Services and Social Innovations under the President of the Republic of Azerbaijan.

"ASAN" Service is the first state social-innovation project, as well as intellectual product of Azerbaijan presented to the world. Nowadays, several Asian and African countries take advantage of its experience in this field and are implementing it, even some international organizations advise using the ASAN model as an advanced pilot project. [13]

"ASAN" Service carries out various technical and promotional work in attracting startup projects to joint development programs and ensuring their access to service information, in order to accelerate the development of information and communication technologies in the social sphere and solve problems in the public sphere.

One of the bright projects of "ASAN" can be considered the concept of "myGov". Through this platform, citizens will be able to clarify information about themselves, send requests to government authorities for amendments and additions to relevant information. [14]

In order to receive and jointly develop proposals coming from the citizens related to the implementation of projects and innovations, the platform "The Unified Bank of Ideas" was put into use, which announces interim contests, evaluates and analyzes ideas. [15]

As part of the INNOLAND acceleration program, a new "Demo Day" program has been developed, according to which startups are given a chance to find a sponsor by speaking to investors and experts. Investments in the amount of more than 600 thousand AZN have been attracted thanks to this program up to date, 25% out of them are foreign investments. [20]

## Conclusion

We have discovered in the article, that there is several importance of social innovations under the circumstances of ICT as the main driver of public governance, and the role of personal and organizational relationships of the workers belonging to the mentioned sphere in improving the living standards of population. We have tried to indicate all the possible levels of the process of introducing information and communication technologies into our lives.

The article also establishes such indicators of society's needs as individual, group, general consumer, the solution of which mainly depends on the communication and professionalism of workers in this field, who can form public leverage for this sphere. Exactly they can formulate generally available leverages of application for this field. We have mentioned here that main attention is paid to understanding the correlation and interaction of people with social innovations and the security system of social technologies. From the methodological perspective, the article is mainly based on such concepts as "sociality", "manufacturability", "safety" and "security".

## Literature


1. Walter Isaexon "Steve Jobs" October 24, 2011.
2. Kalyugina S.N. "Innovations in social sphere of organization: essence, types, distinctive characteristics"; included into the collection "Problems of development of innovative-creative economy". 2010, p.319-322.
3. World Economic Forum / flickr.com (CC BY-NC-SA 2.0)
4. https://ict.az/ru/content/85
5. https://www.trend.az/business/economy/2744831.html
6. https://www.trend.az/business/economy/2973836.html
7. https://ru.president.az/azerbaijan/leader
8. Social Innovation: Blurring Boundaries to Reconfigure Markets (Englisch) Gebundenes Buch – 16. Dezember 2011
9. https://www.sostav.ru/publication/zeytz-project-rasskazali-kak-tratit-na-poligrafiyu-menshe-32973.html
10. https://ru.sweden.se/ljudi/uvazhenie-lichnosti-so-shkolnoj-skami/
11. https://londonrus.co.uk/investitsionnye-proekty-v-velikobritanii.html
12. https://gelbasla.com/monitoring-evaluation-accountability-and-learning-meal-officer-only-national-applications/7809.html
13. https://www.asan.gov.az/en
14. https://my.gov.az/intro/
15. https://1news.az/news/innovacii-ot-asan-xidmet-raspoznavanie-predmetov-opredelenie-emociy-i-mnogoe-drugoe---foto
16. http://innoland.az/az/news/20


### Sosial innovasiyalar informasiya cəmiyyətinin inkişafinin seqmenti kimi

### Xülasə


Bir çoxlarına məlumdur ki, "innovasiya" anlayışının mahiyyəti konkret bir sistemin fəaliyyət göstərməsində məqsədyönlü dəyişikiklər kimi müəyyən edilir. Bu dəyişikliklər həm kəmiyyət, həm də keyfiyyət dəyişiklikləri ola bilər.

İnformasiya və Kommunikasiya Texnologiyaları (İKT) sahəsində innovasiya proseslərinin inkişafı bütün sosial infrastruktura böyük təsir göstərir: bizim idarəetmə tərzimiz, cəmiyyətlə qarşılıqlı münasibət modellərimiz dəyişir. Həmçinin, maddi və mənəvi motivasiya, sosial baxış və s. də dəyişir.

Beləliklə, biz bu məqalədə müəyyən etdik ki, bu sahədəki sosial innovasiya özündə müxtəlif sosial problemlərin sosial xidmətlər və sosial innovasiya işçiləri tərəfindən həll edilməsi prosesini əks etdirir.


### Социальные инновации как сегмент развития информационного общества

### Резюме


Многим известно, что суть понятия «инновация» определяется как целевое изменение в функционировании определенной системы. Эти изменения могут быть как качественные, так и количественные изменения.

Развитие инновационных процессов в сфере ИКТ показывает огромное влияние на всю социальную инфраструктуру: меняются наши стили управления, модели взаимодействия с обществом, изменяются материальная и моральная мотивация, социальный взгляд и т. д.

И так, в этой статье мы определили, что социальная инновации в этой сфере представляет собой процесс разрешения различных социальных проблем социальными службами и работниками инноваций.


**Rəyçi: t.e.n. R. Həşimov**

Göndərilib: 14.03.2020 Qəbul edilib: 17.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/141-143

**Lalə İlqar qızı Abdurahmanova**
Bakı Dövlət Universiteti
l_abdurahmanova@mail.ru

# DÖVLƏTİN TURİZM SFERASINDA FƏALİYYƏT İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *turizm fəaliyyəti, dövlət siyasəti, vətəndaş, iqtisadiyyat, vergi, turist*
***Key words:*** *tourist activity, public policy, citizen, economy, tax, tourist*
***Ключевые слова:*** *туристическая деятельность, государственная политика, гражданский, экономический, налоговый, туристический*

## Giriş

Turizm fəaliyyəti ayrı-ayrı şəxslərin istirahət və asudə vaxt hüququnun səmərəli keçirilməsi, ödənişli dövri məzuniyyət hüququnun realizəsi ilə bağlı münasibətləri əhatə edən bir fəaliyyət növü hesab edilə bilər. Eyni zamanda ayrı-ayrı dövlətlər iqtisadi gəlir əldə etmək maraqları baxımından ölkə turizminin inkişafına yönələn tədbirlər işləyib hazırlayırlar. Bu gün dövlətimiz həm daxili turizmin inkişafına, həm də bu sahədə beynəlxalq əməkdaşlığın genişləndirilməsinə xüsusi diqqət yetirir. Turizm, əhalinin ehtiyaclarını qarşılamağa və əhalinin həyat səviyyəsinin yüksəlməsinə yönəlmiş bir sahə kimi, müasir iqtisadiyyatın inkişafında əhəmiyyətli yer tutur. Eyni zamanda, turizm iqtisadiyyatın digər sahələrindən fərqli olaraq, təbii ehtiyatların tükənməsinə gətirib çıxara bilməz. Çünki turizm ixracata yönəlmiş bir sahədir və dünya bazarlarında qeyri-sabit vəziyyətdə digər sənaye sahələrinə nisbətən daha sabitdir.

Müasir dövrdə turizm bir sıra iqtisadi, sosial və humanitar funksiyaları yerinə yetirərək, bir çox ölkələrin sosial və iqtisadi inkişafının mənbələrinə çevrilmişdir. Azərbaycan Respublikasının cari qanunvericiliyi turistlərin hüquq və mənafelərinin təmin edilməsi və qorunması ilə bağlı münasibətləri tənzimləyir.

## 16.1. Turizmin inkişafına dair dövlət tənzimlənməsi

Milli təcrübəyə nəzər salsaq, turizmə dəstək dövlət siyasətinin əsas istiqamətlərindən biri kimi qiymətləndirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev turizmi hazırda Azərbaycan Respublikasında ən surətlə inkişaf edən sahələrdən biri kimi vurğulayır. Bununla yanaşı, dövlət başçısı həm də qeyd etmişdir ki, turizmin inkişafı prioritet istiqamət kimi müəyyən edilmiş və hal-hazırda ölkəmizin müxtəlif güşələrində dünya səviyyəli turist mərkəzləri və kurortlar fəaliyyət göstərməkdədir[ 4, s 11717].

Bunu eyni zamanda beynəlxalq qurumlar da qeyd edirlər. Dünya Turizm Təşkilatının rəhbərliyi də Azərbaycanda turizmin sferasının inkişafına dair görülən işlərə çox yüksək qiymət verir.

Beynəlxalq turizmdə dövlətimiz nəinki turistləri qəbul edən və ya onları "idxal edən" tərəf kimi, eyni zamanda müvafiq sferada dövlət siyasətinin formalaşdırılması, səlahiyyətli dövlət orqanları vasitəsilə dövlət tənzimetməsini həyata keçirən subyekt kimi iştirak edir [1, s 99]. Belə olduğu halda, sözsüz ki, dövlətin bu sahədə hüquq və vəzifələrə malik olması mühüm əhəmiyyət kəsb edir.

Beynəlxalq hüquq ədəbiyyatlarında mövcud yanaşmaya görə, dövlətin bu sahədə ən mühüm funksiyalarından biri vətəndaşlarının vergi ödəmək qabiliyyətinin təmin olunmasıdır. Bundan başqa, göstərilir ki, sivilizasiyalı cəmiyyətlərdə dövlət turizmi dəstəkləyir və onun inkişafına yardım edir. Turizm fəaliyyətinin tənzimlənməsində dövlətin aşağıdakı məqsədlərin realizəsinə çalışdığını qeyd edə bilərik:

1) İlk növbədə, vətəndaşların konstitusion istirahət hüququnun təmin olunmasının gerçəkləşdirilməsi;
2) Səyahət etmək üçün vətəndaşların gəlirlərin çoxalmasının təmin olunması;
2) Turizm sənayesinin inkişafı nəticəsində yeni iş yerlərinin yaradılması;
4) Turizm abidələrinin bərpası və ətraf mühitin qorunması;
5) Ölkənin mədəni potensialından və turist səfərlərindən turizmin inkişafına dair səmərəli istifadə edilməsi;

Turizm haqqında Azərbaycan Respublikası qanunu da məhz Azərbaycan Respublikasında turizm bazarının hüquqi əsaslarının bərqərar edilməsinə, dövlət siyasətinin prinsiplərini, turizm fəaliyyətinin əsaslarını müəyyən etməyə, turizm sahəsində meydana çıxan münasibətləri tənzimləməyə, sosial-iqtisadi inkişafı təmin edən vasitələrdən biri kimi turizm ehtiyatlarından səmərəli istifadə olunmasına yönələn dövlət siyasətini ifadə edir.

Eyni zamanda, sözügedən Qanunda Turizm infrastrukturu sahəsində münasibətlərin təkmilləşdirilməsinə yönəlmiş normativ-hüquqi aktların qəbul edilməsi, turizm infrastrukturu sahəsində elmi-tədqiqatların inkişaf etdirilməsi, turizm infrastrukturu sahəsində xüsusi razılığın verilməsi, standartlaşdırılması və turizm məhsu-

lunun sertifikatlaşdırılması, daxili və dünya turizm bazarında turizm məhsulunun hərəkətə gətirilməsinə kömək göstərilməsi və s. aydın şəkildə göstərilmişdir.

### 16.2. Turizm sahəsində dövlət siyasəti, onun prinsip və prioritetlərinə dair təkliflər

Dövlət turizmin ölkə iqtisadiyyatının gəlir gətirən sahəsi kimi davamlı və ahəngdar inkişafına, xalqların mədəni və mənəvi cəhətlərdən yaxınlaşması və qarşılıqlı anlaşılmasına xidmət edən təsirli və məqsədyönlö dövlət siyasətini işləyib hazırlayır və həyata keçirir. Eyni zamanda, turizm fəaliyyətində ən əlverişli şəraitin yaradılmasına, turizm ehtiyatlarının təyinatına uyğun olaraq istismarına və ətraf mühitin qorunmasına zəmanət verir. Vətəndaşların istirahət-rekreasiya, asudə vaxtını sərbəst təşkil etmək və keçirmək hüquqlarını, habelə turizmlə bağlı və ya turizm sahəsindəki münasibətlərindən irəli gələn digər hüquqlarını təmin edir və bu hüquq və azadlıqların səmərəli müdafiəsini təşkil edir.

Turizm sahəsində dövlət tənzimləməsinin əsas prinsipləri kimi aşağıdakılar qeyd oluna bilər:

- Turizm sahəsində təhlükəsizliyin təmin olunması;
- Turizm sahəsində standartların və idarəetmə tələblərinin müəyyən edilməsi;
- Müxtəlif səviyyəli dövlət orqanları arasında, eləcə də dövlət orqanları ilə yerli özünüidarəetmə orqanları arasında dəqiq səlahiyyət bölgüsünün aparılması;
- İnnovativ texnologiyaların turizm sahəsinə tətbiqi

Dövlət turizm sahəsini iqtisadiyyatın prioritet istiqaməti kimi tanıyır, turizm strategiyasını müəyyən edir, bu siyasətə və strategiyaya uyğun inkişaf plan və proqramlarını tərtib və təsdiq edir, həmin proqramların həyata keçirilməsi üçün müvafiq iş planları və nəzarət mexanizmləri tətbiq edir:

- Turizm sahəsinin davamlı inkişafı üçün turizm sahəsində elektron hökumətin qurulmasını təmin edilməli, ölkədə səmərəli turizm sənayesinin yaradılması və rəqabətin gücləndirilməsi üçün normativ tənzimlənmə həyata keçirilməlidir;
- Ölkə hüdudlarından kənarda da Azərbaycan Respublikası haqqında təhlükəsiz, cəlbedici və əlverişli bir turizm məkanı təsəvvürünün formalaşmasi üçün turizm məhsulunun təşviqini həyata keçirilməlidir.
- Turizm sahəsində ən çox tələb olunan peşə və ixtisasların müəyyən olunması üçün monitorinq və proqnozlaşdırma sisteminin yaradılmalı, əmək bazarı üçün prioritet peşələr üzrə peşə və təlim standartlarının hazırlanması və tətbiqi təmin edilməlidir.
- Turizm təhlükəsizliyinin əsasları, üsul və vasitələri müəyyən edilməlidir. Ekoloji turizmin inkişafı nöqteyi nəzərindən ətraf mühitin (təbiətin) qorunması, səmərəli və davamlı istifadəsi üçün hüquqi tənzimləmə həyata keçirilməlidir.
- İctimai qaydaya riayət edilməsinə, ictimai mənəviyyatın və qonaqpərvərliyin təbliğinə, habelə digər mədəniyyətlərlə münasibətlərin qurulmasına dair maarifləndirmə aparılmalıdır.
- Turizmdən yerli əhalinin rifah səviyyəsini yüksəltmək və yoxsulluğu aradan qaldırmaq üçün istifadə edilməlidir.

Dövlət turizm fəaliyyətini gömrük, investisiya, viza rejimi, rüsum və digər məcburi ödənişlərə güzəşt və imtiyazlar vasitəsi ilə, habelə dövlət tərəfindən tənzimlənən tariflərdə güzəşt və imtiyazlar verilməsi, maliyyə institutlarının vəsaitlər ayırması, sosial-iqtisadi proqramların tətbiqi və qanunla qadağan edilməyən digər vasitələrlə stimullaşdırır. Turizm fəaliyyətinə rəvac vermək məqsədilə dövlət büdcəsindən subsidiyalar və eyni zamanda, onlardan turizmin inkişafına xidmət edən məqsədyönlü fondlara maliyyə vəsaitləri ayrıla bilər. Bu vəsaitlər həm müxtəlif səviyyəli proqramlar (dövlət proqramları, bölgə proqramları, yerli proqramlar) çərçivəsində, həm də ayrı-ayrı hüquqi aktlarla ayrıla bilər.

Dövlət orqanları və yerli özünüidarəetmə orqanları öz əsasnamələrinə uyğun olaraq turizm fəaliyyətini dəstəkləyir, turizm məhsullarının hərəkətə gətirilməsinə, habelə beynəlxalq turizmin inkişafına rəvac verir, beynəlxalq bazara nüfuz edirlər. Respublikamızda fəaliyyət göstərən turizm infrastrukturu subyektləri üçün məcburi olan idarəetmə tələbləri Birləşmiş Millətlərin Ümumdünya Turizm Təşkilatının tövsiyələrinə uyğun olaraq nəzarət orqanı tərəfindən müəyyən edilir.

### Nəticə

Turizmin inkişafına dair dövlət proqramının işlənib hazırlanması, turizmdə sahələrarası və regionlararası fəaliyyətin əlaqələndirilməsi, turizm qanunvericiliyinin icrasına nəzarətin həyata keçirilməsi, turizm təşkilatlarının dövlət reyestrinin aparılması dövlətin bu sferada mühüm addımlarındandır.

Belə hesab etmək olar ki, dövlət - yaradılmış müvafiq orqanlar vasitəsilə turizm siyasətini və dövlət tənzimetməsini müəyyənləşdirən, turizmin hərtərəfli inkişafı məqsədilə addımlar atan, onun həyata keçirilməsi üçün imkanlar yaradan, geniş səlahiyyətlərə malik bir təsisatdır.

Müvafiq qanunvericilik aktında bir sıra çatışmayan cəhətlər qeyd etsək, deyə bilərik ki, mövcud sahədə dövlət siyasəti tam müəyyən olunmur. Turizm sferasında Azərbaycan Respublikasının dövlət siyasətinin sərhəd, vergi, valyuta, gömrük və digər nəzarət formaları üçün əlverişli şəraitin yaradılmalıdır.Turizm sahəsində dövlətin maraq və mənafelərinin qorunmalı, rəqabət qabiliyyəti gücləndirilməli, antiinhisar qanunvericiliyə əməl olunmalı, turizm sənayesinin inkişafında milli və xarici investisiyaların təşviqi və digər bu kimi istiqamətlər müəyyən olunmalıdır.

**Ədəbiyyat**

1. Əliyev Ə.İ., Aslanov E.Z. Beynəlxalq turizm hüququ. Dərslik. Bakı: NAT MMC,2011, 475 s.
2. "Turizm haqqında" Azərbaycan Respublikasının Qanunu //http://www.e-qanun.az
3. Azərbaycan Respublikasında turizm fəaliyyətinin hüquqi tənzimetmə modeli // Qanun jurnalı, 2015, № 06 (248), s. 93-99
4. //http://president.az/articles/

**Directions of state activity in the field of tourism**

**Summary**

Tourism activity can be considered as a type of activity that covers the relations of individuals related to the effective exercise of the right to rest and leisure, the right to paid periodic leave. At the same time, individual countries are developing measures aimed at developing the country's tourism in the interests of economic gain. Today, our state pays special attention to the development of domestic tourism and the expansion of international cooperation in this field. Tourism, as an area aimed at meeting the needs of the population and improving the living standards of the population, plays an important role in the development of the modern economy. At the same time, tourism, unlike other sectors of the economy, cannot lead to the depletion of natural resources. Because tourism is an export-oriented sector and is more stable than other industries in the volatile world markets

In modern times, tourism has become a source of social and economic development of many countries, performing a number of economic, social and humanitarian functions. The current legislation of the Republic of Azerbaijan regulates relations related to ensuring and protecting the rights and interests of tourists.

**Направление деятельности государства в сфере туризма**

**Резюме**

Туристическую деятельность можно рассматривать как вид деятельности, который охватывает отношения отдельных лиц, связанные с эффективным осуществлением права на отдых и досуг, права на оплачиваемый периодический отпуск. В то же время отдельные страны разрабатывают меры, направленные на развитие туризма в стране в интересах экономической выгоды. Сегодня наше государство уделяет особое внимание развитию внутреннего туризма и расширению международного сотрудничества в этой области. Туризм как сфера, нацеленная на удовлетворение потребностей населения и повышение уровня жизни населения, играет важную роль в развитии современной экономики. В то же время туризм, в отличие от других отраслей экономики, не может привести к истощению природных ресурсов. Потому что туризм является экспортно-ориентированным сектором и более стабилен, чем другие отрасли на волатильных мировых рынках.

В наше время туризм стал источником социально-экономического развития многих стран, выполняя ряд экономических, социальных и гуманитарных функций. Действующее законодательство Азербайджанской Республики регулирует отношения, связанные с обеспечением и защитой прав и интересов туристов.

**Rəyci: h.f.d.G.Rzayeva**

Göndərilib: 21.03.2020 Qəbul edilib: 23.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/144-145

**Tural Novruz Ismayilzadeh**
Baku State University
infoismayilzade@gmail.com

# THE PROCESS OF DEVELOPING SOCIAL INNOVATIONS IN AZERBAIJAN AND ITS PERSPECTIVES
## (Theses)

Intensive development of production and the application of innovative technical processes contributed to the reduction of the time for innovation cycles; also acceleration is observed for the tempo of updates, developed technologies and manufactured products. [1]

The available system of priorities regarding the budgetary funds of enterprises and organizations involved in innovative activities is currently not effective. Their fundamental bases are underestimated in terms of the development of the components of an innovation system.

In case of crisis circumstances, funds are allocated from the state budget to finance applied studies that will not be competitive in the domestic and foreign markets. Unfortunately, the lack of mechanisms for determining the priorities for scientific and technological development by the government, as well as the lack of methodological criteria for an objective assessment of the activities of various scientific organizations do not make it possible to direct resources to support national scientific institutions and organizations involved in innovative activities.

Nowadays, it is very important to pursue a government policy aimed at solving the problems of innovative growth of the national economy, contributing to the organization of the innovation process at all its levels. [2]

Important role is assigned to allocations from state budget when financing the science sector. They can cover the most part of costs for critical research projects of state importance.

Financing from the state budget is a guarantee of the uninterrupted functioning of research, which is of a long-term nature, and may not always lead to results that will quickly improve the economy and social life.

A number of economic reforms have been introduced in our country recent years, thanks to which the Azerbaijani economy has almost doubled its efficiency, and this is unprecedented in the world. The volume of gross investment in 2018 in the national economy amounted to 21,974.2 million AZN, which is 69.3% more compared to 2005 [3].

It is important to mention that great part of gross investments in national economy are internal capital contributions. Compared to the previous years, there has been a significant increase in the amount of funds allocated for science. However, even this growth is not yet enough according to government strategic priorities and plans. Government authorities and business entities must carry out the most important efforts in order to significantly improve the situation.

“Establishment of space industry in Azerbaijan was the result of practical work implemented in recent years. It means, we should always look forward and see the perspectives. We should not be satisfied just with the achieved successes. A success achieved today should become the foundation for bigger steps tomorrow. Especially, we should always be one step forward, leave both our competitors and the time behind in the field of information technologies developing rapidly all over the world.” [4]

This speech was made by President Ilham Aliyev at the expanded meeting of Cabinet of Ministers dedicated to the results of social-economic development in 2009, where he talked about the measures taken for the development of information and communication technologies.

Azerbaijan is a developed industrial-agrarian state with developed manufacturing, where oil and gas production, oil processing industry and other sectors took the most important positions.

According to the results of the studies, one can talk regarding the main challenges in the sphere of application of social innovations in Azerbaijan, namely:

- ✓ Aging scientific personnel and small proportion of turnover for young human resources;
- ✓ Physical and moral depreciation of production base;
- ✓ Lack of knowledge and methods of introducing studies into reality, as well as inconsistency of the stages of the innovation cycle.

The government of the country has set the following tasks to activate innovative performance [5]:

- ✓ Establish scientific-research institutes;

✓ Create favorable economic, social-cultural and legal environment for implementing innovative processes;
✓ Carry out the modernization of material-technical resources based on new high technologies (High-Tech);
✓ Achieve new and improved order in economic sectors from technological perspective;
✓ Enhance the level of high technological export, energy and economic security;
✓ Stimulation of creative activity and intellectual potential of population.

Certain important state programs have been adopted in order to accelerate social-economic development of capital city and regions of the country in recent years. This enables to construct and commission extremely important infrastructure facilities in all sectors. In this regard, important works have been done since 2013. We can highlight the following among those measures:

✓ Shipyard and ship repair plant in Baku – Azerbaijan has become the first country in the region building the ships;
✓ International logistics center in the International Airport named Haydar Aliyev;
✓ Gas-turbine thermal power plant;
✓ The clinic of surgery under the Medical University;
✓ Hotel “Fairmont Baku” and the complex of “Flame Towers” etc.

As a consequence of successful investment policy, a number of important infrastructure facilities have also been constructed in other sectors.

Furthermore, the results of government innovation policy [6] are known, which contribute to the intensive development of innovation and investment activities in the Republic of Azerbaijan:

✓ A system has been formed for introducing priority projects in the field of innovations;
✓ The foundations are established for normative regulation of innovation process;
✓ The government provides feasible support to innovation enterprise of small business through the development of regional and sectoral venture companies;
✓ Projects having high potential for introducing innovations are realized in the regions of Azerbaijan;
✓ a system of state support for innovation processes has been formed, technological zones have been created, special attention is paid to the development of the infrastructure for introducing innovative achievements.

## Literature

1. V.V.Jarikov, I.A.Jarikov, V.G.Odnolko, A.I.Yevseytsev. Management of innovation processes: tutorial. Tambow, Publishing house of Tambow State Technological University, 180 p., 2009
2. Vasilyeva O.N., Zaskanov V.V., Ivanov D.Y., Novikov D.A. Methods and incentives of material stimulation (theory and practice) / Edited by professor V.G. Zaskanov and professor D.A.Novikov. M.: LENAND – 288 p., 2007;
3. http://www.stat.gov.az/menu/6/statistical_yearbooks/source/azfigures_2018-Web page of State Statistical Committee of the Republic of Azerbaijan;
4. https://ict.az/ru/content/85
5. https://1news.az/news/sovremennyy-azerbaydzhan-innovacionnyy-i-kosmicheskiy;
6. https://azertag.az/ru/xeber/Nacionalnaya_innovacionnaya_politika_v_deistvii-1303775.

**Rəyçi: t.e.n. R. Həşimov**

Göndərilib: 14.03.2020 Qəbul edilib: 17.03.2020

## PEDAQOGİKA PEDAGOGY ПЕДАГОГИКА

DOI: 10.36719/AEM/2007-2020/52/146-150

**Günay Musa qızı Quluzadə**
Bakı Slavyan Universiteti
gunay_quluzade00@mail.ru

# PEDAQOGİKA ELMİNDƏ YAŞ DƏRƏCƏLƏRİNİN XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *Yaş, psixoloji xüsusiyyət, məktəb, müəllim, bölgü*
***Key words:*** *Age, psychological characteristics, school, teacher, division*
***Ключевые слова:*** *возраст, психологическая особенность, школа, учитель, деление*

İnsan öz inkişafında müxtəlif yaş dövrlərindən keçir və hər bir dövr şəxsiyyətin inkişafına müəyyən təsir göstərir. Pedaqogika tarixində insanın yaş dövrləri ilə bağlı müxtəlif mülahizələr irəli sürülmüşdür (Aristotel, N.Gəncəvi, Y.A.Komenski, C.C.Russo və b.). Məsələn, Y.A.Komenski dörd fəslə müvafiq olaraq insan həyatını dörd dövrə bölmüşdür: həyatın bahar dövrü (uşaqlıq), yay dövrü (gənclik), payız dövrü (orta yaş), qış dövrü (qocalıq). C.C.Russo uşaq və gənclik illərini dörd yaş dövrünə bölmüş və hər dövr üçün səciyyəvi tərbiyə sahəsini göstərmişdir:

I - fiziki inkişaf dövrü (0-2 yaş);
II - hisslərin inkişafı dövrü (2-12 yaş);
III - zehni inkişaf dövrü (12-15 yaş);
IV - əxlaqi inkişaf dövrü (15-18 yaş).

Yaş dövrlərinin göstərilən bölgüləri elmi bölgü hesab edilə bilməz. Hazırda pedaqoji, psixoloji və herontoloji baxımdan insanın aşağıdakı yaş dövrləri müəyyən edilmişdir: **çağalıq və körpəlik dövrü (0-3 yaş); məktəbəqədər dövr (3-6 yaş); kiçik məktəbli dövrü (6-10 yaş); yeniyetməlik dövrü (10-15 yaş); gənclik dövrü (15-30 yaş); yetkinlik dövrü (30-60 yaş); ahıllıq dövrü (60-75 yaş); qocalıq dövrü (75-90 yaş); uzunömürlülük dövrü (90-150 yaş).**

Hər yaş dövrü özünəməxsus xüsusiyyətlərə malikdir. Tərbiyəçi bu xüsusiyyətlərdən çıxış edərək şəxsiyyətin formalaşmasını düzgün istiqamətləndirə bilər. Yaş xüsusiyyətlərinin nəzərə alınması pedaqoji prinsiplərin ən aparıcılarındandır. Ona söykənərək, müəllim tədris yükünü reqlamentləşdirir, müxtəlif növ əməklə məşğulluğun həcmi müəyyənləşir. Gün bölgüsü, əmək rejimi və istirahət üçün müvafiq şərait yaradılır. Məktəb yaş dövrünə qədəm qoyan uşağın fəaliyyətində, ünsiyyətində və başqa adamlarla münasibətində kəskin dönüş yaranır. Təlim onun aparıcı fəaliyyət növü olur, həyat tərzi dəyişir, yeni vəzifələr meydana gəlir, ətrafında olan adamlarla yeni münasibətlər yaranır.

**Məktəbəqədər yaş dövrünün xüsusiyyətləri.** Məktəbəqədər tərbiyə müəssisələrinin prqoramı mühüm dövlət sənədi olub, məktəbəqədər yaşlı uşaqlarla aparılan təlim-tərbiyə işlərinin məzmununu, məqsədini və vəzifəsini özündə əks etdirir. Proqram uşaqların yaş və fərdi xüsusiyyətlərini nəzərə alaraq, onların hərtərəfli inkişafına xidmət edir. Uşaq bağçasında uşaqların həyat və fəaliyyəti proqramın tələblərinə müvafiq qurulur. Onların təlim fəaliyyəti, fiziki, əxlaqi və estetik tərbiyəsi bu mühüm sənəd əsasında həyata keçirilir. Uşaqların məktəbə qəbulu 6 yaşdan başladığı üçün proqramda məktəbəqədər yaş dövrü psixi-fizioloji və metodoloji baxımdan aşağıdakı qaydada təsnif olunmuşdur:

**-anadan olduğu vaxtdan 1 yaşadək – körpəlik dövrünün birinci qrupu;**
**- 1 yaşdan 2 yaşadək – körpəlik dövrünün ikinci qrupu;**
**- 2 yaşdan 3 yaşadək – körpəlik dövrünün böyük qrupu, eyni zamanda bağça dövrünün kiçik qrupu;**
**- 3 yaşdan 4 yaşadək – bağça dövrünün orta qrupu;**
**- 4 yaşdan 5 yaşadək – bağça dövrünün böyük qrupu;**
**- 5 yaşdan 6 yaşadək – bağça dövrünün məktəbə hazırlıq qrupu;**

Uşaq ilk doğulan gündən çəkisi və boyu artmağa başlayır. Anadan normal olmuş uşağın çəkisi 2800-4500 qr olur. Bu dövrdə fiziki və sinir sisteminin inkişafı sürətli olur. İlk yarımildə körpə hər ay 600-700 qr çəkisini artırır. Uşaq həyatının hər ayı ərzində 2-3 sm boyu artır. Birinci ilin sonunda onun çəkisi 10,5 kq, boyu 74-75 sm. olur. Normal inkişaf edən uşaq 7-8 aylığında süd dişi çıxarmağa başlayır. Normal doğulmuş uşağın boyu 50-60 sm-ə qədər olur. Uşaq doğulduqdan 10-15 gün sonra onda şərti reflekslər əmələ gəlir. Bu yaşda sümükdə kalsium duzlarını sürətli mənimsəmə prosesi gedir. Bu isə sümüklərin yavaş-yavaş

bərkiməsini təmin edir. Sümükdə duzların kifayət qədər olmaması nəticəsində raxit xəstəliyi meydana gəlir. Bu dövrdə döş qəfəsi daha sürətlə inkişaf edir. Uşaqlar 2-3 aylığında hərəkət edən əşyaları izləməyə vərdiş edir, səsin görünməyən mənbəyini hiss edir, başını səs gələn tərəfə çevirir. Ona görə də uşağın gözlərindən 40-60 sm aralı parlaq oyuncaq asır və hərəkət etdirirlər. 2,5 aylığında körpə artıq tez-tez gülümsəyir, «qı», «kxı» səslərini tələffüz edir. İlk 2,5-3 aylığında körpədə hərəkət inkişaf etməyə başlayır. 1,5 aylığında körpəni qarnı üstündə uzanmağa öyrətmək lazımdır. 3 aylığında artıq qarnı üstündə çox yaxşı uzanır. 2,5-3 aylığında 5-6 aylığınadək körpələrdə görmə, eşitmə və səs reaksiyalarının təkmilləşməsi baş verir. Əllərinin qamarlama hərəkəti inkişaf edir, sürünməyə hazırlıq hərəkətləri əmələ gəlir. Üç aylıq körpə artıq öz anasını tanımağa başlayır, 6 aylığında isə tanıdığı adamı görəndə sevinir, yad adamı görəndə isə qəmginləşir, onda uşaq yaşlıların nitqinin intonasiyasını yəni ciddi yaxud əzizləmə olduğunu seçə bilir. Belə ki, əgər onunla kəskin danışırlarsa, körpə ağlayır. 4-5 aylığında uşaqda a-a-a tələffüzü alınır. 6-7 aylığında isə eyni hecanı dəfələrlə təkrar edir ba-ba-ba. Uşağın nitqini inkişaf etdirmək üçün böyüklər də bu cür səslər çıxarmalıdırlar. 6-7 aylığında uşaqlar "haradadır?" sualına cavab olaraq başlarını sorşulan əşyaya tərəf çevirilər. Əgər əşyanın yeri dəyişdirilərsə, uşaq onu tapa bilməz, çünki, o, əşyanı olduğu yerə əsasən tapır (məsələn, pəncərənin yanında). 9-10 aylığında olan uşaqlar isə əşyanı yerləşdiyi yerdən asılı olmayaraq tapa bilirlər. Buna görə də əvvəlcə əşyalar həmişə müəyyən olunmuş yerə qoyulmalıdır: stolun üstünə, pəncərəyə və s. yaşlılar əşyanın adını çəkərkən yalnız uşağın ona baxmasına deyil, həm də uşağın əşyaya toxunmasına və onun səsini eşitməsinə çalışmalıdırlar. 9-10 aylığında uşaqlarda formalaşdırılmış bacarıqlar onların psixi inkişafı üçün böyük əhəmiyyət kəsb edir. Bu bacarıqlarla müstəqil hərəkət etmək, oyuncaqlarala məqsədyönlü məşğul olmaq, yaşlıların hərəkətlərinə və nitqinə diqqət yetirmək və s. daxildir. Hərəkət sümük-sinir sisteminin möhkəmlənməsinə zəmin yaradır, bacarıqların formalaşmasına kömək edir. 11 aylığında uşaqların əksəriyyəti müstəqil olaraq ayaq üstə durur, hərəkət edir, (tərbiyəçinin əlindən yapışmaqla), bir yaşına yaxın isə müstəqil olaraq hərəkət edirlər. Nəticədə uşağın əli azad olur, bu isə əşyalarla məşğul olmaq və ətrafdakılarla tanış olmaq üçün əlverişli şərait yaradır. Müstəqil yeriməyə öyrətməyin effektiv üsulu uşağın ilk addımı atmasına məcbur edən vəziyyətin yardılmasından ibarətdir. Məsələn, tərbiyəçi cəlbedici oyuncağı göstərməklə uşağı çağırır, körpə ona tərəf dartınır və ilk addımı atır. Bu zaman uşağı yıxılmaqdan qorumaq lazımdır, çünki yıxılmaq qorxusu hərəkətin inkişafını ləngidə bilər. 9-10 aylıqdan 1 yaşadək uşaqların əşyalarala fəaliyyətində keyfiyyət dəyişiklikləri baş verir. Bir yaşın sonlarında uşaqlar tərəfindən başa düşülən ehtiyat sözlər sırasına "olar" və "olmaz" sözləri də daxil olur. Həmin dövrlərdə uşaqlarda səs reaksiyalarının intensiv inkişafı baş verir. Onlar tələffüz üçün asan olan hecaların təkrarından ibarət olan sözləri tələffüz edirlər: ba-ba, ab-ab, bax, ma-ma, və s. Bu yaşda uşaqlara böyüklərin sözlərini təqlid etmək öyrədilməlidir. 9-12 aylığında olan yşaqlar digər uşaqların nə etdikləri ilə maraqlanırlar. Bəzən onlar bir-birinə yaxınlaşıb gülümsünür, əksər hallarda isə biri o birinin əlindəki oyuncağı almağa çalışır. İki yaşında olan uşaqlar hər ay öz çəkilərini 170-190 qram, boylarını isə 1 sm artırırlar. İki yaşa yaxınlaşanda uşağın çəkisi orta hesabla 12 və ya 7 kq, boyu 85-86 sm olur. İki yaşlı uşağın 20 ədəd süd dişi olur. Sinir sisteminin iş qabliyyəti artır. Sutkalıq yatmaq vaxtı 14 saatdan 12,5 saata enir. Bu dövrdə uşaqlarda inkişaf davam edir, lakin bu proses müəyyən qədər zəifliyir. Uşaq 1,5 yaşında olanda 3-3,5 saat, ikinci ilin sonunda isə 5 saat oyaq qala bilir. Orqanizm möhkəmlənir, müqaviməti artır, ona görə də uşağın xəstələnmə ehtimalı da azalır. Bu yaşda uşağın oyununu təşkil edərkən ona müxtəlif ölçülü toplar, arabacıqlar və s. vermək olar. Bu dövrdə uşaqlarda öyrənmə həvəsi artır, müşahidəçilik qabliyyəti güclənir, xüsusən, görmə həsaslığı xeyli çoxalır. İkinci ilin sonuna yaxın uşaqlarda hərəkət daha da inkişaf edir. Onlar çevik və cəld hərəkətlər edirlər. Həyatın ikinci ilində uşaqlarda öyrənmə güclənir. Bu yaşda olan uşaqların həyatında oyun böyük əhəmiyyət kəsb edir. Oyun zamanı uşaqlar müxtəlif əşyalarla rəftar etmək bacarığına yiyələnirlər. Bu da uşaqlarda müstəqil hərəkəti inkişaf etdirir, eləcə də onlar adamlarla qarşılıqlı münasibəti öyrənir, ətraf mühit haqqında isə təsəvvürləri genişlənir. Oyuncaqların sistemlə düzülməsi oyun zamanı onlardan səmərəli istifadə etməyə şərait yaradır. İki yaşında olan uşaqlarda nitq inkişaf edir və təkmilləşir. Yaş yarımlıq uşaq cəmi 30-40 söz öyrənir. Bəzən bir sözlə müəyyən bir fikri ifadə edir. Çox vaxt sözləri düzgün ifadə etmir, kəkələyir, onun nə demək istədiyini yalnız yaxın adamlar, xüsusən ata-anası tez başa düşür. İki yaşın sonunda uşaq 300-ə qədər söz işlədir ki, bunlardan bəziləri hətta əşyaların keyfiyyətinə aid olur. Onun nitqində qısa cümlələr tədricən geniş yer tutmalıdır. Üç yaşında uşaqlarda oyaq qalma vaxtı artaraq 6-6,5 saat olur. Onlarda gəzinti vaxtı da artır, çünki, onlar daha müstəqil olurlar. Birinci gəzinti 2 saat, ikinci gəzinti 1,5 saat olur. Uşaq üç yaşında olanda onun fiziki inkişafı ləng gedir. Bir ildə uşağın çəkisi orta hesabla 2-2,5 kq, boyu isə 7-8 sm artır, lakin onlar artıq daha möhkəm və dözümlü lurlar. Bu yaşda uşaq 6 saatdan 6,5 saata kimi oyaq qala bilir. Bu yaşda uşağın yeriməsi xarakter alır, tədricən artıq hərəkətlər yox olur, "dayan" işarəsi ilə uşaq hərəkətlərini ləngidir. Uşaq müstəqil geyinir, soyunur, əl-üzünü yuyur, karandaşla işləyir, yapma işləri görür. Yaxşı işdən sevinir, müvəffəqiyyətsizlik baş verdikdə kədərlənir. Üç yaşında uşağın nitqi

yaxşılaşır, xatirələr danışır, nəticə çıxarır, təbiət hadisələrinə öz münasibətini bildirir, göy guruldayanda "yağış yağacaq" deyir. Üç yaşda uşaqda lüğət ehtiyyatı zənginləşir, 1200-1300 sözdən istifadə edir, böyüklərin dediyi sözü təkrarlayır, öyrəndiyi şeiri yadda saxlayır və yada salır, nitq hissələrindən bacarıqla istifadə edir. Bu yaşda uşaqların nitq inkişafını, ətraf mühitə münasibətini formalaşdırmaq üçün didaktik vəsait komplektindən istifadə etmək çox faydalıdır. Həyatının üçüncü ilində uşağın inkişafı xeyli ləng gedir. Üçüncü ilin sonunda uşağın 93-94 sm, çəkisi 14 -15 kq olur. Uşaqların boyu əsasən qılçaların uzanması hesabına artır. 3 yaşından 6 yaşadək olan dövr uşaqların bağça dövrüdür. Bu yaş dövrü üçün xarakterik olan xüsusiyyətləri ümumiləşmiş şəkildə aşağıdakı kimi şərh edə bilərik: -3-4 yaşında uşaqlarda özünütəsdiq yaranır. Mümkün reaksiyalar meydana çıxır: qulaq asmamaq, tərslik, neqativizm, "böyükləri məcburetmə ("Mən özüm", "Mən özüm bilərəm", yalnız özünü lovğalandırma, özünü öymə), təklikdə oynama həvəsi yaranır. - 4-5 yaşında uşaqlarda maraq dairəsi genişlənir, "nə üçün", "niyə", "nəyə görə" sualları meydana çıxır. - 5-6 yaşlı uşaqlarda böyüklərlə münasibətlər uyğunlaşır, uşaqlarla ünsiyyət və münasibətlər inkişaf edir, uşaqlarda liderlik və tabe olma münsibətləri yaranır. Şəkilçəkmə, konstruktor bacarıqlar, musiqi qabiliyyətləri nkişaf edir. Təxəyyülün inkişafı prosesi baş verir. Digər insanlarla birlikdə dialoji nitq xeyli inkişaf edir. Məktəbə hazırlığın formalaşması dövrü başlayır. Məktəbə getməyə həvəslə çalışır. Məktəbə hazırlığın formalaşması – uşağın yazının, oxunun öyrənilməsinə formal şəkildə hazırlığı, onun məktəbə psixi hazırlığı, eyni zamanda zehni, emosional və sosial inkişafının əsas göstəriciləri deməkdir. İlk əxlaqi-etik anlayışlar da yaranır. Nəyin yaxşı, nəyin pis olduğunu anlayır. İntellektal sahədə isə diqqətin cəmləşməsi, eşidilənləri dərketmə, lüğət fondunun inkişafı, nitqin inkişafı, əyani obrazlı təfəkkürün inkişafı, fonematik eşitmə, ümumləşdirmələr bacarığı, reallığa emosional yanaşma tərzi, məntiqi dərketmə tərzi, görmə-hərəkət koordinasiyası inkişaf edir. Bağça yaşlarında uşağın orqanizmi daha da möhkəmlənir, dünyagörüşü genişlənir, biliyi artır, fəallığı və müstəqil davranışı xeyli dərəcədə inkişaf edir. **Kiçik məktəb yaşlı uşaqların (6-10)** hələ zəif olan orqanizmində bir çox yeni keyfiyyətlər əmələ gəlir. Məktəbəqədər yaş dövrünə nisbətən boyun inkişafı ləngiyir, çəki isə nəzərə çarpacaq dərəcədə artır. Bu yaşda skeletdə sümükləşmə gedir, lakin hələ başa çatmır. Diqqət yetirilməsə, uşağın onurğası asanlıqla əyilə bilər. Bu dövrdə uşağın əzələ sistemi intensiv inkişaf edir, əzələlərin qüvvəsi xeyli artır. Bunun sayəsində uşaq sürətlə yazı vərdişlərinə yiyələnir. Həmin dövrdə uşaqlarda əsəb sistemi təkmilləşir, baş beynin böyük yarımkürələrinin funksiyaları intensiv inkişaf edir, beyin qabığının analitik və sintetik funksiyaları güclənir. Bu yaş dövrunda uşagın beyninin çəkisi demək olar ki, böyük adamın beyninin çəkisi qədər olur və 1400 qrama çatır. Uşağın psixikası sürətlə inkişaf edir. Hiss orqanlarının dəqiqliyi yüksəlir. Kiçik yaşlı məktəblilərin qavrayışı sabit və mütəşəkkil olmasa da, onlar ətraf aləmi həvəslə, emosional qavrayırlar. Müəllimlər buna arxalanaraq şagirdləri məqsədyönlü dinləməyə alışdırır, onlarda müşahidəçilik qabiliyyətini inkişaf etdirirlər. Məktəb həyatı uşaqdan ixtiyari diqqəti daim məşq etdirməyi, onu cəmləmək üçün iradi səy göstərməyi tələb edir. Onlarda ixtiyari diqqət bağça yaşına nisbətən bir qədər qüvvətlənsə də, onlar hələ özlərini ev tapşırığını icra etməyə məcbur edə bilmirlər, diqqətlərini uzun müddət bir iş üzərində toplamaqda çətinlik çəkirlər. Bu yaşda uşaqların diqqəti teztez yayınır, təfəkkürü emosional-obrazlı təfəkkürdən abstrakt-məntiqi təfəkkürə doğru inkişaf edir. Təlim onların intellektini sürətlə inkişaf etdirir. Kiçik məktəb yaşlı uşaqların diqqəti həcm etibarı ilə də geniş olmur, onlar eyni zamanda iki iş üzərində diqqətlərini bölə bilmirlər. Məsələn, yaza-yaza danışa bilmirlər. Onların təfəkkürü nitqlə qarşılıqlı əlaqədə inkişaf edir. Bu yaşda uşaqların söz ehtiyatı artır, fikirlərini şifahi və yazılı ifadə etməkdə çətinlik çəkmirlər. Məktəblinin idrak fəaliyyətində hafizənin böyük əhəmiyyəti vardır. Kiçik məktəb yaşlı şagirdlərdə hafizə daha çox əyani-obrazlı xarakterdə olur. Şagirdlər təlim materialını daha çox mexaniki öyrənmə yolu ilə yadda saxlayırlar. Onlar böyük bir seiri, mətni çətinlik çəkmədən olduğu kimi əzbərləyir, lakin onu öz sözləri ilə danışmaqda çətinlik çəkirlər. Hafizənin bu cür xüsusiyyətindən uşaqların söz ehtiyatını artırmaq ücün istifadə olunmalıdır. Bununla bərabər, müəllim onlarda məntiqi yaddasaxlamanı da inkişaf etdirməyə çalışmalıdır. Şagirdlərə özünənəzarət bacarıqları, özünüyoxlama vərdişləri aşılanmalı, tədris əməyinin səmərəli təşkili üçün zəruri biliklər verilməlidir. Kiçik yaşlı məktəblilərin şəxsiyyətinin təşəkkülü müəllimlər və həmyaşıdları (sinif və ümumməktəb kollektivi) ilə yeni münasibətlərin, yeni fəaliyyət növlərinin (oxumaq, təhsil almaq) və ünsiyyətin təsiri altında baş verir. Kiçik məktəb yaşlı uşaqlarda əxlaqi anlayışların, təsəvvürlərin formalaşması üçün böyük imkanlar vardır. Məktəbdə bu imkanlardan bacarıqla istifadə olunmalı, şagirdlər özünəxidmət əməyinə, ictimai-faydalı əməyə cəlb edilməlidir. Belə fəaliyyət uşaqlarda əməksevərliyi, davranış mədəniyyətini, kollektiv fəaliyyət vərdişlərini və hərtərəfli fəallığı inkişaf etdirir.

**Orta yaş dövrü (11-15 yaş).** Bu yaş dövründa uşaqlarda çox kəskin dəyişikliklər baş verir. Yeniyetmə həm uşaqlıq, həm də ilk gənclik əlamətlərini özündə əks etdirir. Bu dövr həm uşağın özü, həm də onu əhatə edənlər üçün çətin dövr hesab olunur. Çox vaxt bu dövrü "böhran dövrü" adlandırırlar. Bu mərhələdə yeniyetmələr öz uşaqlıq illərindən ayrıla bilmirlər. Onlar fiziki cəhətdən sürətlə inkişaf edirlər. Oğlanların

boy artımı 6-10 sm. qızlarınkı isə 6-8 sm. təşkil edir. Skeletin sümükləşməsi prosesi davam edir, əzələlərin gücü xeyli artır. Daxili orqanlar qeyri-bərabər inkişaf edir, qan damarlarının inkişafı ürəyin inkişafından geri qalır ki, bu da onun fəaliyyət ahəngini (ritmini) pozur, ürək döyüntüsünün artmasına gətirib çırxarır. Yeniyetmə dövrunü səciyyələndirən ikinci mühüm bir xüsusiyyət cinsi yetişmədir. Cinsi yetişmə qızlarda 11 yaşından, oğlanlarda isə bir az gec – 12-13 yaşından başlayır və qızlarda tez də başa çatır. Bu proses orqanizmin həyat fəaliyyətini ciddi dəyişdirir, yeni hiss və həyəcanlar yaradır. Yeniyetmə dövründə sinir sisteminin inkişafi, beynin daxili quruluşunun mürəkkəbləşməsi davam edir. Bu da yeniyetmənin zehni fəaliyyətinin inkişafı üçün əlverişli şərait yaradır. Bu zaman şüurun rolu artır, instinktlər və emosiyalar üzərində baş beyin qabığının nəzarəti yaxşılaşır. Yeniyetməlik yaşında uşağın fikri fəaliyyətində əhəmiyyətli irəliləyişlər baş verir. Təfəkkür daha sistemli, ardıcıl və yetkin olur. Yeniyetmənin təfəkküründə tənqidçilik əlaməti meydana gəlir. O, öz fikrini söyləməyə çalışır, mübahisəyə girişir, etiraz edir, hər şeyə tənqidi münasibət bəsləyir. Yaradıcı təfəkkürün inkişafı üçün bu yaş dövrü olduqca əlverişlidir. Odur ki, uşaqlara daim problemli çalışmalar vermək, onlara müqayisələr aparmağı, hadisələrdə və proseslərdə səbəb-nəticə asılılıqlarını müəyyənləşdirməyi tapşırmaq lazımdır. Təfəkkürün inkişafı yeniyetmənin nitqi ilə qırılmaz surətdə bağlıdır. Təfəkkürün inkişafı nətcəsində nitq düzgün, məntiqli, inandırıcı, obrazlı və təsiredici olur. Yeniyetməlik yaşında şəxsiyyətin intensiv əxlaqi və sosial formalaşması baş verir. Bu dövrdə məktəblinin dünyagörüşü, əxlaqi prinsipləri hələ sabit olmur. Onlarda müsbət keyfiyyətlərlə yanaşı, səhv, yetkin olmayan, hətta əxlaqa zidd hərəkətlərə də təsadüf olunur. Yeniyetmələr özlərini yaşlı adamlar kimi aparmaq istəyirlər. Yeniyetmə yaş dövrünün bir sıra ziddiyyətləri vardır. Yeniyetmə oğlanların güclü, mərd, cəsur idealları arasında təəssüf ki, quldurlar, xuliqanlar da olur. Yeniyetmələr onların hərəkətlərini yamsıladıqlarından bəzən hüquq qaydalarını pozurlar. Bu ziddiyyətlərin qarşısının alınmasında düzgün təşkil edilmis tərbiyə mühüm rol oynayır. Yeniyetmələrin əxlaqi və sosial davranışında hisslər xüsusi əhəmiyyət kəsb edir. Əgər kiçik yaşlı məktəblilərdə hisslər impulsiv olursa, orta məktəb yaşlarında isə düşünülmüş və güclü olur. Xüsusilə nifrət hissi özünü daha güclü büruzə verir. Bir çox pedaqoqlar bu dövrü ağır böhran dövrü də adlandırırlar. İnadkarlıq, eqoizm, qaradinməzlik bununla izah olunur. Ona görə də yeniyetmələrin hisslərinə ehtiyatla, diqqətlə yanaşmaq lazımdır. Yeniyetmələrdə peşələrə meyil, maraq yaranır, onlar peşələrin əhəmiyyəti, faydası haqqında düşünür, istədikləri sənətə yiyələnməyə çalışırlar. Onların əksəriyyəti təmiz və vicdanlı əməyin mənasını düzgün başa düşür, peşəseçməyə və ümumiyyətlə, gələcəyə məsuliyyətlə yanaşırlar.

**Böyük məktəbli yaş dövrü (16-18 yaş)**. Bu dövrdə məktəblinin anatomik-fizioloji inkişafı davam edir. Beyin tam inkişaf mərhələsinə gəlir. Boy inkişafı və skeletin sümükləşməsi qurtarır, daxili sekresiya vəziləri inkişafını başa çatdırır. Əzələlərin qüvvəsi, həmçinin iş qabiliyyəti xeyli artır, hərəkətin tənzim edilməsi qaydaya düşür və yaşlılarınkına çatır. Bədənin dəyişməsi sürəti əvvəlki dövrə nisbətən xeyli azalır: boy ildə 1,5-2,5 sm, çəki isə 2-4 kq artır. Cinsi yetişmənin birinci mərhələsi başa çatır. Bu yaş dövrü ilk gənclik dövrü kimi də səciyyələndirilir. Bu dövr gənclərin dünyagörüşünün, əqidəsinin, xarakterinin və həyat yolunun müəyyənləşdirilməsi dövrüdür. Yuxarı sinif şagirdləri tədris fənlərinə seçmə münasibət bəsləyirlər. Onlar təlim materialını müvəffəqiyyətlə təhlil edir, ümumiləşdirmələr aparır, mühakimə yürüdərək nəticələr çıxarmaqda çətinlik çəkmir, mücərrəd anlayışları asanlıqla dərk edirlər. Seçdikləri peşələrlə bağlı biliklərə tələbat onların xarakter əlamətlərindən biridir. Bu, psixi proseslərin inkişafını və fəaliyyətini müəyyən edir. Belə ki, gənclik dövründə qavrayış istiqamətliliyi, diqqət ixtiyariliyi və sabitliyi, hafizə məntiqiliyi ilə xarakterizə olunur. Yuxarı sinif şagirdlərinin təfəkkürü yüksək səviyyədə ümumiləşdiriciliyi, mücərrədliyi, müstəqilliyi, məntiqili-yi ilə fərqlənir, yavaş-yavaş nəzəri və tənqidi istiqamət kəsb etməyə başlayır. Bu dövr əqli fəaliyyətin yüksəliş dövrüdür. Bu dövrdə həm də psixi proseslər əhəmiyyətli şəkildə təşəkkül tapır. Yeniyetməlik dövründə oğlanlar fiziki hazırlığa daha çox diqqət yetirdikləri halda, yuxarı sinif şagirdləri intellektual keyfiyyətləri yüksək dəyərləndirirlər. İntellektual qabiliyyətli şagirdlər sinifdə böyük nüfuza malik olurlar. Bu yaşda şagirdlərin əxlaqi və sosial keyfiyyətləri sürətlə formalaşır. Bu dövrdə gənclər həyatda fəal mövqe tutmağa can atır, ictimai borca şüurlu münasibət bəsləyir, sözü ilə işini gündəlik davranış normasına cevirməyə çalışırlar. Onlarda əxlaqi anlayışlar və kateqoriyalar formalaşır. Onlar öz «mən»ini ifadə etməyə, özünütəsdiqə və özünü reallaşdirmağa, başqalarının diqqətini cəlb etməyə cəhd edir, peşə seçməyə çalışırlar. İlk gənclik dövründə etik problemlərə güclü maraq yaranır. Ilk məhəbbət oğlan və qızların həyatına həyəcanlar gətirir, onları o qədər də asan olmayan məsələlərin həllinə sövq edir. Bu yaşda "əbədi" problemlərə – həyatın mənası, xoşbəxtlik, borc, vicdan, namus, şərəf, şəxsiyyət azadlığı və s. problemlərə maraq böyük olur. Həmin yaş dövründə şagirdlərdə şüurlu davranış motivləri güclənir. Kollektivdə şəxsiyyətin yeri, kollektivin üzvləri arasında ünsiyyətin və münasibətlərin xarakteri mühüm əhəmiyyət kəsb edir. Kollektiv əlaqə və münasibətlər genişlənir. Gənclərdə həyata tənqidi münasibət güclənir. Onlar hərəkətlərini şüurlu surətdə tənzim etməyə çalışırlar. Yuxarı sinif şagirdlərində, adətən, tədris

fənlərinə seçimli münasibət özünü göstərir. Həyat üçün mühüm olan bilik müvəffəqiyyətinə tələbat hazırkı dövr yuxarı sinif şagirdlərinin xarakterik xüsusiyyətlərindən biridir. Bu, inkişafı təyin edir, psixi proseslərin funksiyalaşmasına kömək edir. Qavrayış burada məqsədyönlülüklə xarakterizə olunur. Diqqət – sərbəstlik və sabitliklə, yaddaş isə məntiqi xarakterə malikdir. Yuxarı sinif şagirdlərinin təfəkkürü daha yüksək səviyyəli ümumiləşdirmə və mücərrədləşmə ilə bağlıdır. Burada tədricən nəzəri və tənqidi istiqamət özü üçün yer alır. Gənclik bütün zehni fəaliyyətin çiçəkləndiyi dövrdür. Yuxarı sinif şagirdləri burada təbiətin, ictimai həyatın bütün hadisələrinin mahiyyətinə daxil olmaq istəyir, onlar arasındakı qarşılıqlı əlaqələri və qarşılıqlı asılılığı öyrənməyə can atırlar. Demək olar ki, belə canatma daim öz xüsusi nəzər nöqtəsini formalaşdırmağa imkan verir, gedən hadisələrə öz qiymətini, öz dəyərini verməyə istiqamətləndirir. Gəncin öz nəzər nöqtəsi heç də ümumi şəkildə qəbul olunmuş qaydalarla uyğunlaşmır. Yuxarı sinif şagirdinin mənəvi və sosial keyfiyyətləri son dərəcə güclü templə formalaşır. Buna nəinki mənəvi kamilliyin senzitiv dövrü, həm də fəaliyyət xarakterinin dəyişməsi, cəmiyyətdə və kollektivdə vəziyyətin dəyişməsi, ünsiyyətin intensivliyi, yeni şərait kömək edir. Bu dövrdə əxlaqi anlayışlar daha ciddi şəkildə olur, dəyərlər müəyyənləşir, etik inam möhkəmlənir, böyüklük hissi daha da dərinləşir və itiləşir. Öz fərdiliyini ifadə etməyə canatma yaranır. Gənclik yaş dövründə etik problemlərə maraq güclənir. İlk sevgi nəinki gənc insanların həyatına güclü hisslər, həyəcanlar daxil edir, həm də onları praktik olaraq o qədər də asan olmayan məsələləri həll etməyə məcbur edir. Bəzi pedaqoqlar hesab edirlər ki, məhz şəxsiyyətin həlli xarakteri, etik vəziyyətlər mənəvi, əxlaqi inkişaf üçün əsas meyar kimi xidmət edir. Bu yaş dövründə daimi problemlərə maraq daha da güclü olur: həyatın mənası, xoşbəxtlik, mənəvi borc, şəxsi azadlıq – bütün bunlar daha böyük maraq kəsb edir. Son dövrlərdə bəzi gənc insanlar dinə xüsusi maraq göstərir, meyil edirlər. X-XI sinfi şagirdlərinin həyat planları, dəyər oriyentasiyaları, meyilləri, sənət seçimi ilə bağlı ciddi differensiasiya ilə onların öz maraqlarına və fikirlərinə görə seçilir, lakin onlardan hər biri həyatda əsas yer tutmaq, maraqlı iş, yaxşı qazanc əldə etmək və xoşbəxt ailə başçısı olmaq arzuları ilə yaşayırlar.

### Ədəbiyyat

1. Azərbaycan Respublikasının Ümumi Təhsilinin Milli Kurikulumu. Bakı, 2009.
2. Məktəbəqədər müəssisələrdə tərbiyə və təlim proqramı. Bakı, 1998.
3. Bədəlova Ə.S. Azərbaycan xalq pedaqogikası. Bakı: Müəllim, 2009.
4. Əliyev R.İ. Tərbiyə psixologiyası. Bakı: Nurlan, 2006.
5. Əliyev İ.İ. Azərbaycan etnopedaqogikası. (Dərs vəsaiti) Bakı: Nurlan, 2010.
6. Əlizadə Ə.Ə.Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Ozan, 1998.
7. Kərimov Y.Ş. Pedaqoji tədqiqat metodları. Bakı: Azərnəşr, 2009.
8. Qasımova Ləzifə, Mahmudova Rəhimə. Pedaqogika. Bakı: Bakı Dövlət Universiteti, 2003, səh. 23.
9. Firədun Nadir oğlu İbrahimov Rüfət Lətif oğlu Hüseynzadə "PEDAQOGİKA" dərslik I cild. Bakı 2012

### Age characteristics in pedagogical science

**Summary**

Various considerations have been made in the history of pedagogy regarding the age of the person. This age distribution cannot be considered a scientific breakdown. Each age has its own peculiarities. The following divisions are conventionally available: childhood and infancy (0-3 years); preschool (3-6 years); junior school age (6-10 years); adolescence (10-15 years); youth (15-30 years); maturity (30-60 years); age of maturity (60-75 years); old age (75-90 years); life expectancy (90-150 years).

### Возрастные характеристики в педагогической науке

**Резюме**

В истории педагогики были высказаны различные соображения относительно возраста человека. Распределение по возрасту, показанное здесь, не может рассматриваться как научное расстройство. У каждого века есть свои особенности. Следующие подразделения обычно доступны: детство и младенчество (0-3 года); дошкольный (3-6 лет); младший школьный возраст (6-10 лет); подростковый возраст (10-15 лет); молодежь (15-30 лет); срок погашения (30-60 лет); возраст зрелости (60-75 лет); старость (75-90 лет); ожидаемая продолжительность жизни (90-150 лет).

**Rəyçi: dos. X.Novruzova**

Göndərilib: 19.03.2020 Qəbul edilib: 21.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/151-152

**Офелия Намик гызы Джавадова**
Бакинский государственный университет
ofa.dzhavadova@mail.ru

# ЦЕЛИ И ЗАДАЧИ МОНИТОРИНГА
## (Тезисы)

***Ключевые слова:*** *мониторинг, образовательный процесс, единый подход, оценка*
***Açar sözlər:*** *monitorinq, tədris prosesi, eyni yanaşma, qiymətləndirmə*
***Key words:*** *monitoring, teaching process, same approach, assessment*

В работе мы опишем основные цели и задачи мониторинга.

Каждое учебное заведение стремится обеспечить нормальное функционирование и развитие об-сыразовательного процесса, добиться качественного образования и необходимого уровня мотивации учащихся, здоровья и развития.

Для современных учителей важно не только овладеть надежными и объективными методами контроля и оценки деятельности учащихся, но и понять перспективы применения диагностических методов, применимых к современным концепциям «мониторинга обучения». Проблема контроля качества системы в учебном процессе является одной из основных проблем в управлении процессом. Без специального отслеживания процесса с использованием единого подхода трудно представить успехи учащихся в освоении предмета.

Чтобы эффективно решать проблемы, с которыми сталкиваются современные школы, необходимо осуществлять их деятельность на основе диагностики и прогноза, чтобы обеспечить рост детей в соответствии с их личными характеристиками (при осуществлении педагогического мониторинга).

Мониторинг-набор динамических наблюдений, используемых для анализа и оценки прогноза общего состояния системы.

Педагогический мониторинг - это система сбора, обработки и хранения информации о функционировании системы обучения и качестве образовательного процесса, обеспечивающая постоянное развитие системы образования, обновление и прогнозирование ситуации развития. Педагогический мониторинг представляет собой динамическую систему управления эффективностью, которая может прогнозировать деятельность учащихся и преподавателей, и ее целью является расширение деятельности по мониторингу и оценке: учителя – анализируют свою работу, ее результаты и эффективность; студенты - формируют объективное представление о своей деятельности и достижениях, развивают независимость и ответственность, формируют самоконтроль и самооценку.

Мониторинг - это больше, чем просто мониторинг или диагностика чего-либо. Мониторинг идет дальше из-за его регулярности, пристального внимания к решению проблем управления и высоких технологий.

Цели мониторинга:- динамически отслеживать качество образовательных услуг, предоставляемых школой; определить эффективность управления качеством обучения.

Задачи мониторинга:

-постоянно следить за состоянием образовательного процесса и своевременно получать достоверную информацию о процессе;

- своевременно находить изменения в учебном процессе и их причины;

-Предотвращение неблагоприятных тенденций в образовательном процессе;

- краткосрочные прогнозы развития образовательного процесса;

-Оценка эффективности методического обеспечения;

Целью современного экологического мониторинга является создание основы для защиты окружающей среды.

В качестве средства управления и контроля учебного процесса мониторинг обучения обеспечивает регулярную обратную связь об уровне обучения учебных материалов путем систематического мониторинга степени или уровня подготовки. В контексте инновационной деятельности мониторинг преподавания может стать механизмом в системе образовательного процесса, который поможет стимулировать, активизировать и развивать учащихся и дать им большее чувство свободы и ответственности. При организации систем мониторинга очень важным является экономический аспект: монито-

ринг ради самого мониторинга не имеет смысла, поэтому основное значение должно придаваться мониторингу, способному продемонстрировать, в какой степени удовлетворяются цели политики защиты окружающей среды.

**Литература**

1. Горб В.Г. Педагогический мониторинг образовательного процесса как фактор повышения его уровня и результатов . - 2000. - № 5. - 33-37 с.
2. Бардовский Г.А.Управление качеством образовательного процесса.- СПб.- 2001.

**Рецензент: д.ф.п.Г.Г.Тагиева**

Göndərilib: 12.03.2020 Qəbul edilib: 14.03.2020

DOI: 10.36719/AEM/2007-2020/52/153-156

**Günay Musa qızı Quluzadə**
Bakı Slavyan Universiteti
gunay_quluzade00@mail.ru

# FERMA ƏDƏDLƏRİ, FERMA NÖQTƏSİ VƏ FERMA TEOREMLƏRİ

***Açar sözlər:*** *Pyer Ferma, teorem, mahiyyət, isbat, nəticə, düstur, nöqtə, üçbucaq*
***Key words:*** *Pierre Ferma, theorem, essence, proof, result, formula, point, triangle*
***Ключевые слова:*** *Пьера Ферма, теорема, суть, доказательства, результат, формула, точка, треугольники*

Pyer Ferma 17 avqust 1601-ci ildə Fransada dünyaya gəlmişdir. O, XVII əsrin ən nəhəng riyaziyyatçılarından biridir. Ədədlər nəzəriyyəsi, həndsə, cəbr, riyazi analiz (maksimum və minimumların tapılma üsulları), ehtimal nəzəriyyəsilə məşğul olmuşdur. Rene Dekartla birlikdə analitik həndəsənin yaradıcılarından biridir. Ədədlər nəzəriyyəsində onun iki teoremi – Fermanın böyük və kiçik teoremləri xüsusilə məşhurdur. O, heç bir kitab yazmamışdır (o vaxtlar elmi jurnallar da yox idi). Ondan yalnız dostlarına yazdığı məktublar qalmışdır. Lakin bu məktublarda riyaziyyata aid faktlar Fermanı Fransanın ən böyük riyaziyyatçılarından birinə çevirir. P.Ferma və B.Paskalın bir-birinə, yazdıqları məktublardakı faktlar Ehtimal nəzəriyyəsinin inkişaf tarixinin başlanğıcıdır. Fermanın əyriyə toxunan düz xəttin qurulmasına, əyrixətli trapesiyanın sahəsinin tapılmasına, əyrinin uzunluğunun hesablanmasına tətbiq etdiyi, üsullar diferenesial və inteqral hesabının yaradılmasına yol açdı. Bunlara baxmayaraq, Fermanı məşhurlaşdıran onun ədədlər nəzəriyyəsinə aid işləri olmuşdur. Fermanı həlli olmayan məsələlər daha çox maraqlandırırdı. Onun ən məşhur “mümkünsüzlük” haqqında təklifi Fermanın böyük teoremidir .

**Ferma ədədləri haqqında.** XVII əsrin məşhur riyaziyyatçısı Pyer Ferma $2^{2n}+1$ şəklində olan ədədləri öyrənmişdir. Bu ədədləri Ferma ədələri adlandırırlar. Alim qəbul etmişdi ki bu ədədlərin hamısı sadə ədədlərdir. Onun buna əsası da vardır. Ona görə ki, n=0; 1; 2; 3; 4 qiymətləri üçün, həqiqətən Ferma ədədləri sadə ədədlərdir. Ancaq XVIII əsrdə Leonard Eyler göstərdi ki, $2^{25}+1 = 2^{32}+1 = 4294967297$ ədədini 641 və 6700417 sadə ədədlərinin hasili şəklində göstərmək olar. Digər tərəfdən yuxarıda göstərilən beş ədəddən başqa sadə Ferma ədələrinin olması məlum deyil. Maren Mersenə (1588-1648-ci illərdə yaşamış Fransız rahibi, həmçini riyaziyyatçısı, əgər $2^n$ -1 sadə ədəddirsə onu Mersen ədədi adlandırırlar) ünvanladığı məktublarının birində Pyer Ferma belə bir təklif irəli sürür ki, n ikinin qüvvətidirsə $2^n+1$ şəklində olan ədədlər mütləq sadədir. Ferma həmçinin bilirdi ki, n ikinin qüvvəti deyilsə, onda $2^n+1$ ədədi sadə deyil. Bu vaxta kimi isə yüz ildən də çox Fermanın hipotezi yaşadı. Sonra yoxlanılan bütün Ferma ədədləri mürəkkəb oldular və ilkin fərziyyəyə tam zidd olan bir təbii fərziyyə meydana gəldi: bəlkə Ferma ədədlərinin arasında sadə ədəd olanlarının sayı sonludur? Ferma ədədlərinin kifayət qədər ümumi xassələri bəllidir. Məsələn, istənilən iki Ferma ədədi qarşılıqlı sadə ədədlərdir. Karl Qauss hələ 19 yaşının tamam olmasına 1 gün qalmış isbat etmişdir ki, düzgün n-bucaqlı, pərgar və xətkeşin köməyilə yalnız və yalnız onda qurula bilər ki ( hələ lap qədimlərdən yunan və bir sira digər yerlərdəki məşhur alimlərə məlum olan düzgün 3, 4, 5, 6, 15 bucaqlıların qurulmasından başqa), onun tərəflərinin sayı n= $2^{2n}+1$ şəklində göstərilə bilsin və bu da ki, Ferma ədədinin ümumi halıdır. Qeyd edək ki, Qauss bu kəşfilə neçə minillərdir ki alimləri narahat edən hansı düzgün bucaqlıları xətkeş və pərgarın köməyilə qurmaq olar sualına cavab tapmış oldu, həmçinin n=2 olduqda çevrəni düzgün 17 bərabər hissəyə bölməyin mümkünlüyünü isbat etmiş oldu (n=3 olduqda 257 olar). Ferma ədədlərinin sadə ədədlərin öyrənilməsində ümumnəzəri əhəmiyyəti aşağıdakı teoremlə ifadə olunur: Əgər $a \geq 2$ və $a^n+1$ sadədirsə, onda "a" cütdür.

**Ferma nöqtəsi.** Həndəsədə çox gözəl bir teoremin adı Fermanın adı ilə bağlıdır. Bu üçbucaqda Ferma-Toriçelli nöqtəsinin tapılmasıdır. Bu nöqtə keçmişin ən böyük 3 riyaziyyatçısının adı ilə bağlıdır. İlk dəfə onun haqqında Pyer Fermanın işlərində danışılır. O, ABC üçbucağının daxilində elə F nöqtəsinin yerləşməsi haqqında məsələni tələb edirdi ki, FA+FB+FC cəmi minimal olsun. İsveçrə alimi Yakob Şteyner bu məsələyə daha ümumi halda baxmışdır: o, 3 məntəqəni birləşdirən ən qısa yol şəbəkəsinin tapmağa çalşırdı. Məlum olur ki, şəbəkə mütləq bir nöqtədə birləşən düzxətli yollardan ibarət olmalıdır, belə ki, yollardan biri nöqtəyə çevrilə bilər. Belə qoyuluşda məsələ sırf praktiki əhəmiyyət daşıyır, məsələn, naqil şəbəkələrinin çəkilişində belə bir məsələni həll etmək lazım gəlir.

**Nöqtənin qurulması.** Fermanın klssik məsələsinin həlli üçün belə bir fiziki modeli bu formada qurmaq olar: Hər hansı lövhə üzərində bir üçbucaq çəkək. Onun təpələrinə mismar vuraq, bütün mismarlardan ucunda eyni ağırlıqda yük olan sap keçirək və nəhayət, sapların digər boş qalmış uclarını bir nöqtədə düyünləyək.

Yüklər buraxıldıqda sapı dartacaqlar. Bu halda sapların sallanmış hissələrinin uzunluqları cəmi ən böyük, düyündən mismarlara qədər olan məsafələrin cəmi isə ən kiçik olacaq. Beləliklə, yüklərin buraxıldığı andan etibarən, düyün bizim axtardığımız nöqtə olacaq. Üçbucağın verilən şərtləri ödəyən bu nöqtəsini civə barometrinin ixtiraçısı kimi tanınan Evangelista Toriçelli qurmuşdur. Belə nöqtə yalnız bucaqları 120-dən böyük olmayan üçbucaqlarda mövcuddur və bu nöqtə Ferma nöqtəsilə üst-üstə düşür, yəni söhbət eyni bir minimal cəm nöqtəsinin qurulmasından gedir. Toriçelli qurmasından fərqli olaraq bu nöqtə üçbucağın bucaqlarından biri 120-dən böyük olduqda belə həll olunur, və bu halda F nöqtəsi kor bucaq təpəsilə üst-üstə düşür. Bu nöqtəni belə də almaq olar: üçbucağın tərəfləri üzərində onun xaricində hər tərəfin ölçüsünə uyğun olaraq müvafiq düzgün üçbuçaqlar quraq. Sonra isə əvvəlcədən verilmiş üçbucağın təpəsini onun qarşısındaki tərəf üzərində qurulmuş düzgün üçbucağın təpəsilə birləşdirək. Hər üç parça bir-birlərilə 60 bucaq əmələ gətirirlər və yalnız bir nöqtədə Toriçelli yaxud da Ferma nöqtəsində kəsişirlər.




**Fermanın kiçik teoremi** – natural ədədlərin bölünməsi nəzəriyəsində ən fundamental faktlardan biridir. Teoremin ifadəsi belədir: Əgər p sadə ədəddirsə, a ədədi p-yə bölünməyən natural ədəd olarsa, onda $a^{p-1}$ ədədi p-yə bölünəndə qalıqda 1 qalır. Teoremi başqa cür belə ifadə etmək olar: "Əgər p sadə ədəd, a ixtiyari natural ədəddirsə, ($a^p$-a) ədədi p-yə bölünür." Ferma bu teoremin isbatını saxlamamışdır. Teoremi ilk dəfə L. Eyler isbat etmişdir.

**Fermanın böyük teoremi** Bu teorem Diofantın "Hesab" kitabının ikinci hissəsində, 8-ci məsələnin qarşısında yazılmışdır: "Verilən kvadartı iki kvadrata ayırın". Başqa sözlə desək, verilmiş a ədədi üçün $x^2 + y^2 = a^2$ tənliyini rasional həllərini tapmaq tələb olunur. Bu da ki bizlərə çox yaxşı tanış olan Pifaqor teoremidir və onun sonsuz sayda həlli var. Ferma qeyd etmişdir: "Kubu iki kuba, kvadratın kvadratını iki kvadratın kvadratına, ümumiyyətlə dərcəsi ikidən böyük sonsuzluğa qədər heç bir qüvvəti bütün həmin dərəcəli iki qüvvətə ayırmaq olmaz. Mən bunun həqiqətən çox gözəl isbatını tapmışam, ama onun üçün yer olduqca azdır". Başqa sözlə $x^n + y^n = z^n$ qeyri-müəyyən tənliyinin n≥3 olduqda, heç bir rasiolnal həlli yoxdur. Bu təklif Fermanın böyük və ya sonuncu teoremi adlanır. Onun isbatını riyaziyyatçılar 356 ildən çox axtarmalı olmuşlar.

**Teoremin isbatı.** Fermanın özü yalnız n=4 halında teoremin isbatını saxlamışdır. Leonard Eyler bu teoremi n-in 3 və 4, Lejandr n-in 5, Dirixle isə 7 qiymətləri üçün isbat etdi. Leonard Eyler teoremin n=3 halını isbat etməsindən 30 il keçdikdən sonra bu halı 1768-ci ildə yenidən isbat etdi. Bu teoremlərin hər birinin isbatının hər iki hal üçün olduqca mürəkkəb və uzun olduğunu nəzərə alaraq burada onun isbatlarını vermirik. Bunun üçün tamamilə yeni bir ideya tələb olumurdu. O, burda çox cəsarətli bir addım atmışdır. Bu ideyanın mahiyyəti adi tam ədədlərə aid məsələlərin tədqiqində a+b $\sqrt{-n}$, şəklində olan xəyali ifadələrin tətbiqindən ibarətdir. Eyler öz isbatında α = a+b $\sqrt{-3}$ şəklində ifadəyə baxmışdır. Lakin bütün bunlarla və adları sadalanayan məsələlərlə əlaqədar olaraq Eyler öz mülahizəsini əsaslandırmadı və bu məsələlə yenə də Ferma teoreminin isbatı ilə bağlı yenidən XIX əsr riyaziyyatçıları qarşısında dayandı. Ümumiyyətlə, bu halların isbatı üçün tamamilə yeni bir ideya lazım idi ki, bunu da Ferma tapmışdır: bu sonsuz enmə metodudur. Ferma təsdiq etmişdir ki, özünün ədədlərə aid ən məşhur teoremlərini o məhz bu üsulla isbat etmişdir. Enmə üsulu bu gün də ədədlər nəzəriyyəsinə mühüm rol oynayır Teoremin isbatına müxtəlif mükafatlar vəd olundu və bu teoremi isbat etməyə cəhd göstərən və ya teoremi isbat etdiyini düşünən böyük bir fermatistlər ordusu əmələ gəldi. Riyaziyyat kafedralarına hər il teoremin minlərlə isbatı təqdim olunurdu. Bu-

nunla belə, bu isbatların hamısında səhvlər var idi. n-in 100-dən kiçik, hətta 619-dan kiçik qiymətləri üçün də teorem isbat olundu, amma bunlar hələ də Böyük Ferma teoreminin isbatı demək deyildi. Ömrünü-gününü tənliyi doğru bərabərliyə çevirən n-i tapmağa həsr edənlər də, yəni teoremi inkar etməyə çalışanlar da oldu… 1 mart 1847-ci ildə fransız riyaziyyatçısı və fiziki Qabriel Lame Paris Elmlər Akademiyasının iclasında böyük teoremin yeni isbatını məruzə etmişdir. Digrə məşhur farnsız riyaziyyatçısı Liuvill bu barədə yazırdı: “edilən cəhdlər mənə göstərdi ki, əvvəlcə kompleks ədədlər üçün “hasil yalnız bir üsulla sadə vuruqlarına ayrıla bilər” elementar fərziyyəsinə analoji teoremi müəyyən etmək lazımdır. Lamenin fikri məndə yalnız bu fikri təsdiqlədi, burda doldurulası boşluq yoxdur ki?” Bu qeydlər sayəsində riyaziyyatın bu bölməsi bir ilə yaxın müddətdə fransız riyaziyyatçılarının diqqət mərkəzində oldu. Bu sahə ilə Lamenin özü və digər alimlər intensiv şəkildə məşğul oldular. Onların tədqiqatları nəticəsində tam ədədlərin toplama, vurma və bölməyə nəzərən xassələrini ən ümumi şəklidə ifadə edən yeni bir riyazi obyekt – halqa anlayışı formalaşdı. Həmçinin sonralar alman riyaziyyatçısı Böyük teoremlə məşğul olarkən cəbrə yeni mühüm obyektlər – ideallar daxil etmişdir.

1955-ci ildə 28 yaşlı yapon riyaziyyatçısı Yutaka Taniyama riyaziyyatın tamamilə başqa bir sahəsinə aid hipotez irəli sürür. “Taniyama hipotezi” adlanan bu hipotezə görə hər bir elliptik əyriyə bir modulyar forma uyğun gəlir. İkiölçülü əyrilərlə 19-cu əsrdə kəşf olunmuş dördölçülü funksiyalar arasındakı bu uyğunluq bir çox riyaziyyatçılara absurd və paradoksal görünürdü. 1958-ci ildə Taniyama intihar edir… 70-ci illərdə bu hipotezlə maraqlananların sayı artır. Amma bu hipotezi də isbat etmək heç kəsə nəsib olmur. 1985-ci ildə riyaziyyat tarixində ekstravaqant yapon hipotezi ilə böyük Ferma teoremini birləşdirən bir hadisə baş verir. Alman riyaziyyatçısı Gerxard Frey maraqlı bir fikir irəli sürür: “Taniyama hipotezi isbat olunarsa Böyük Ferma teoremi də isbat olunacaq”. Frey müəyyən çevirmələrlə Ferma tənliyini Taniyama hipotezindəki elliptik əyri tənliyinə gətirməyə nail olmuşdu. Freyin tam əsaslandıra bilmədiyi bu hökmünün dəqiq isbatını 1986-cı ildə Kaliforniya Universitetinin professoru Kennet Ribet verir. Beləliklə, isbat olunur ki, Ferma teoremi Taniyama hipotezinin bir nəticəsidir. Deməli, Taniyama hipotezini isbat etmək, həm də Ferma teoremini isbat etmək demək idi! Məhz bu Uayls tərəfindən şərh edilmişdir. Belə hünəri heç kim kifayət qədər az tanınan riyaziyyatçıdan gözləmirdi.

1993-cü ildə Kembridcdə ədədlər nəzəriyyəsinə həsr olunmuş konfransda ABŞ-dan olan ingilis alimi Endryu Uayls Taniyama hipotezini isbat etdiyini deyir və bu isbatı təqdim edir. Uaylsın ideyası xn + yn = zn tənliyi və y2=x(x-an)(x-cn) tənliyi ilə verilən elliptik əyrilər arsındakı çox yaxşı əlaqəyə əsaslanıb. İlk dəfə ona fransız riyaziyyatçısı İv Elleqarş diqqət yetirmişdir. Bu, əlbəttə, əsl sensasiya idi və böyük cəsarət tələb edirdi. Təqdimat uğurla keçir və isbatda səhv tapan olmur, amma bununla bərabər, isbat 6 hissəyə bölünərək, yoxlanılmaq üçün aparıcı mütəxəssislərə təqdim olunur. 2 aydan sonra resenzentlərdən biri olan Nik Kats teoremin isbatının müəyyən yerində bir boşluq olduğunu, əsaslandırmanın zəif olduğunu üzə çıxarır. Ümumilikdə isə onun ideyalarının müasirliyi, dərinliyi və gözəlliyi təsdiq olundu. Ömrünün 20 ildən artığını bu teorem üzərində gizli çalışan Uayls bu xəbərdən sarsılır. Uayls bu ilkin isbatı 1993-cü il 23 iyulda Kembricdə İsaak Nyuton adına Riyaziyyat institutunda oxuduğu mühazirələrində şərh etmişdir. Bu iş gərgin yaradıcı əməyin məhsulu idi. Uaylsın etirafına görə arvadından başqa heç kəs onun bu sahədə işlədiyini bilmirdi. Amma özündə güc tapıb keçmiş aspirantı və dostu Riçard Teylorla bərabər yaranmış vəziyyətdən çıxış yolu axtarır. Bir ildən də az müddətdə onlar isbatdakı probeli bağlamağa nail olurlar və 1994-cü ilin oktyabrında Uayls isbatın düzəldilmiş-korrekt variantını Sürixdə keçirilən riyaziyyat üzrə növbəti Beynəlxalq Konqresə təqdim edir. Bütün riyaziyyat aləmi onun məruzəsini, əlbəttə ki, səbirsizliklə gözləyirdilər. Təbii ki, Uayls isbatı çıxış növbəsinə kimi tamamalamaq istəyirdi, amma o, buna müvəffəq olmadı. Həmkarları onu məruzədən əvvəl auditoriyanın yanındakı pilləkənlərdə oturub necə işlədiyinin şahidi oldular. Uayls kafedraya qalxarkən onu donmuş vəziyyətdə gözləyən zala isbatı tam yerinə yetirmədiyi xəbərini verdi. Zal onu dostcasına alqışladı. Artıq konqresdən bir ay sonra Uaylsın özünün sözlərinə görə əsas ideyası işıqlandı və yaranmış boşluğu nəhayət ki doldura bildi. Bu dəfə isbat son dərəcə dəqiq yoxlanmalara davam gətirdi və çap olundu. Bax beləcə 350 il tarixi olan böyük teoremin isbatı sona çatdı. 1995-ci ilin yayında Priston Universitetində dərc olunan “Annals of Mathematics” yəni, “Riyaziyyat salnaməsi” jurnalı bütünlükdə bu teoremin isbatına həsr olunmuşdur. 100 səhifədən çox həcmə malik olan isbat iki məaqaləyə bölünərək bütün məqaləni tam tuturdu. İsbatın əsas hisəsi təxminən 10 il bu məşhur problem üzərində çalışan Prinston universitetinin professoru 42 yaşlı Endri Wilesə məxsus idi. Son mərhələdə isə Oksford universitetinin professoru Riçard Teylor qoşulmuşdur. O, Uaylsın ilkin isbatında olan boşluğu aradan qaldırmağa kömək etmişdir. Təbii olaraq belə bir sual meydana çıxır: Ola bilərmi ki, bizə gəlib çatmayan Fermanın isbatı(əgər bu olsaydı) Uaylsın variantına analoji olsun? Bu sualla bağlı Uaylsın fikri belə idi: “Ferma belə isbatı verə bilməzdi. Bu iyirminci əsrin isbatıdır”. Fermanın böyük teoremi, elə bil ki, xüsusi xarakter daşıyır. Onu isbat etmək cəhdləri riyaziyyatı yeni ideyalar, nəzəriyyələr, üsullar ilə zənginləşdirdi. Bu teoremin danılmaz əhə-

miyyəti məhz bundadır. XX əsrdə böyük teoremlə sürətlə inkişaf edən riyazi nəzəriyyəylə cəbri həndəsənin əlaqəsi üzə çıxdı. Məhz bu nəzəriyyə çərçivəsində müvəffəqiyyət əldə olundu. Ferma teoreminin isbatında çoxlu riyaziyyatçıların əməyi olmuşdur.

**Ədəbiyyat**

1. "Uşaqlar üçün ensiklopediya. Riyaziyyat.", Bakı, "Şərq-Qərb", 2008. səh.606
2. Fermat, Pierre de // 1911 Encyclopædia Britannica - 11 - New York City: 1911. - Vol. 10. - P. 275.
3. Ферма Пьер // Большая советская энциклопедия: [в 30 т.] / под ред. А. М. Прохорова - 3-е изд. - М.: Советская энциклопедия, 1969.
4. http://www.nytimes.com/1983/07/19/science/german-is-hailed-in-math-advance.html
5. https://az.wikipedia.org/wiki/Pyer_Ferma
6. http://www.imm.az/exp/2017/04/27/fermanin-kicik-teoremi/

**Ferman's numbers, Ferman's point and Ferman's theorems**

**Summary**

Pierre Farm lived in the 17th century. He has not written any books. He has only letters to his friends. His work has made him famous for his theory of numbers. The famous 17th century mathematician Pierre Ferma studied the numbers in the form of $2^{2n}$ + 1. His theorems have become more popular. It took 360 years to prove these theorems. Famous mathematicians have tried to prove the theorem. The English scientist Andrew Wiles proved the theorem. The proof of the theorem was published in 1995 in the journal “Annals of Mathematics”.

**Числа Фермы, точка Фермы и теоремы Фермы**

**Резюме**

Ферма Пьера жил в 17 веке. Он не написал ни одной книги. У него есть только письма своим друзьям. Его работа сделала его известным своей теорией чисел. Знаменитый математик 17-го века Пьер Ферма изучил числа в виде $2^{2n}$ + 1. Его теоремы стали более популярными. Потребовалось 360 лет, чтобы доказать теоремы. Известные математики пытались доказать теорему. Английский ученый Эндрю Уайлс доказал теорему. Доказательство теоремы было опубликовано в 1995 году в журнале “Анналы математики”.

**Rəyçi: dos. X.Novruzova**

Göndərilib: 19.03.2020 Qəbul edilib: 21.03.2020

## JURNALIN İÇİNDƏKİLƏR

### FİLOLOGİYA PHILOLOGY ФИЛОЛОГИЯ



### HÜQUQ THE LAW ПРАВО

## FƏLSƏFƏ VƏ SOSİOLOGİYA PHILOSOPHY AND SOCIOLOGY ФИЛОСОФИЯ И СОЦИОЛОГИЯ



## SİYASİ ELMLƏR POLITICAL SCIENCES ПОЛИТОЛОГИЯ



## PEDAQOGİKA PEDAGOGY ПЕДАГОГИКА

www.aem.az AEM AZ EN TR RU

# "ELMİ İŞ"

## humanitar və ictimai elmlər üzrə aylıq beynəlxalq elmi jurnal

Jurnalda aşağıdakı sahələr üzrə məqalələr dərc edilir:

- Tarix və antropologiya
- Filologiya
- Hüquq elmləri
- Fəlsəfə və sosiologiya
- Siyasi elmlər
- Psixologiya
- Pedaqogika
- Sənətşünaslıq və memarlıq

Məqalələr Azərbaycan, ingilis, türk və rus dillərində qəbul olunur

### Məqalələrin texniki tərtibatına dair tələblər

**Həcmi**
Məqalələr - 8-25 səh.
**Mətnlər** Microsoft Word mətn redaktorunda A4 formatda, hər tərəfdən 2 sm olmaqla Times New Roman şrifti ilə 14 pt ölçüdə, 1,5 sətirarası intervalla, 1 sm abzasla yığılmalıdır.
**Müəllif haqqında** məlumat **sağdan, qalın şriftlə** aşağıdakı qaydada tərtib olunmalıdır:
Müəllif(lər)in adı, atasının adı, soyadı (yalnız ilk həriflər böyük olmaq şərti ilə)
Bu məlumatdan aşağıda müəllif(lər)in iş yeri (qısaltmalardan istifadə etmədən) adi şriftlə (nə qalın, nə kursiv) göstərilməlidir, əgər müəllif məqalə nəşrə təqdim olunan zaman heç bir elm və ya təhsil (orta və ya ali) müəssisəsində çalışmırsa, o zaman iş yeri əvəzinə yaşadığı şəhər və ölkə göstərilir. Müəllifin vəzifəsinin, elmi adı və ya elmi dərəcəsinin göstərilməsinə ehtiyac yoxdur!
Müəllif(lər)in şəxsi **elektron poçt** ünvanı **mütləq şəkildə** iş yeri məlumatlarından sonrakı sətirdə e-mail sözü yazılmadan göstərilməlidir.
**Məqalənin adı** - ortadan böyük hərflərlə (Caps lock-dan istifadə edilərək) qalın şriftlə verilməlidir.
***Açar sözlərlə məqalənin adı arasında məsafə*** aşağıdakı qaydada verilməlidir:
Abzas - interval: əvvəl - 0, sonra - 10
Açar sözlər (Azərbaycan dilində)
Key words (ingilis dilində)
Ключевые слова (rus dilində)
3-6 arası açar söz olmalıdır
İlk olaraq məqalənin yazıldığı dildə olan açar sözlər verilməlidir.
"Açar sözlər", "Key words", "Ключевые слова" söz birləşmələri qalın kursivlə, sözlərin özü isə sadəcə kursivlə yazılmalıdır.
**Məqalənin mətni aşağıdakı hissələrdən ibarət olmalıdır:**
**Giriş** məqalənin aktuallığını və elmi yeniliyini əks etdirməli və 5-10 cümlədən ibarət olmalıdır.
Girişdən sonra başlıqsız olaraq məqalənin əsas mətni başlamalıdır.
Bu iki hissə arasında məsafə "Abzas - interval: əvvəl - 0, sonra - 10" qaydası ilə təyin edilməlidir.

Məqalənin sonunda mütləq olaraq **Nəticə** hissəsi verilməlidir. Nəticə 5-10 cümlədən ibarət olmalıdır və sıra nömrəsi olmadan məqalənin əsas nəticələrini əks etdirməlidir. ("Nəticə" sözü Caps lock-la qalın hərflərlə ortada verilməlidir). Əsas mətnlə Nəticə arasındakı məsafə "Abzas - interval: əvvəl - 0, sonra - 10" qaydası ilə təyin edilməlidir.

**İstinadlar** mətnin içərisində aşağıdakı qaydada yazılmalıdır:

Mətndə mənbənin (fikrin) müəllifi göstərilmədikdə

Müəllifin soyadı - vergül - interval, mənbənin nəşr ili - iki nöqtə - interval - səh. ***Nümunə***: Axundov, 2005: 201)

Əgər müəllifin adı mətndə çəkilirsə o zaman bu qaydada yazılmalıdır: "...A.Axundov (2005: 205) qeyd etmişdir ki..."

**Ədəbiyyat siyahısı** məqalədə **istinad ardıcıllığına uyğun** olaraq aşağıdakı qaydalarla sıra nömrəsi ilə qeyd olunmalıdır və **Ədəbiyyat** kimi verilməlidir.

Məqalənin hazırlandığı dildən fərqli digər iki dildə məqalənin adı göstərilməklə **7-8 cümlədən ibarət Xülasə** yazılmalıdır.

Xülasənin mətnində "Bu məqalədə filan məsələ araşdırılır..." kimi cümlələr qəti şəkildə istifadə olunmamalıdır! Mətndə məqalənin elmi yeniliyini, araşdırılan mövzuya dair fikir və bir-iki cümləylə əldə olunan nəticə izah edilməlidir.

"Xülasə" sözü yazılanda qalın hərflərlə yalnız "X" hərfi böyük yazılmalıdır.

Xülasədə mütləq məqalənin adı verilməlidir!

Xülasənin xarici dillərə tərcümə edilərkən qəti olaraq elektron tərcüməçilərdən istifadə olunmamalıdır.

Cədvəl və şəkillər nömrələnir və bilavasitə mətndə yerləşdirilir. Cədvəl sözü və cədvəlin nömrəsi cədvəlin üst tərəfindən qalın hərflərlə yazılmalıdır.

Məqalənin məzmununa görə məhsuliyyəti müəllif daşıyır.

Redaksiya məqalənin əsas məzmununa xələl gətirmədən redaktə dəyişiklikləri və ixtisarları etmək hüququnu özündə saxlayır.

Məqalələrin məzmunu orjinal, yeni elmi fikir və nəticələri əks etməlidir.

Məqalə tələblərə cavab vermədiyi halda çap olunmur və müəllifə qaytarılmır.

Məqalə həm kağız, həm də elektron formada redaksiyaya təqdim olunmalıdır.

Elmi dərəcəsi olan mütəxəssisin rəyi mütləq şəkildə yazılı şəkildə (imza müəssisə möhürü ilə təsdiq olunmaq şərti ilə) redaksiyaya təqdim olunmalıdır.

Məqalənin sonunda əlaqə üçün telefon nömrəsi qeyd olunması vacibdir.

Məqalənin faylının adında yalnız müəllifin adı və soyadı göstərilməlidir.

**Redaksiya ünvanı:** Bakı ş., Mətbuat pros., 529,
"Azərbaycan" Nəşriyyatı, 6-cı mərtəbə.
www.aem.az saytında məqalələr onlayn yerləşdirilir.
E-mail: elmmerkezi@gmail.com
Tel.: +994 (012) 510 63 99
+994 (050) 209 59 68
+994 (055) 209 59 68

Çapa imzalanmışdır: 28.02.2020
Kağız formatı:
H/n həcmi:.
Sifariş: 256

"ZƏNGƏZURDA" çap evində çap olunub
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: (050) 209 59 68; (055) 209 59 68; (012) 510 63 99
e-mail: zengezurda1868@mail.ru

